# Abbasov Elçin Saleh oğlu



Abbasov Elçin Saleh oğlu 1975-ci ildə Gədəbəy rayonu-nun Şəkərbəy kəndində anadan olmuşdur. 1982-ci ildə Gədəbəy Şəkərbəy kənd orta məktəbinin birinci sinfinə getmiş, 1990-cı ildə həmin məktəbin 8-ci sinfini bitirmişdir. Sonra isə Bakıda texniki peşə məktəbində təhsilini davam etdirmiş və oradan da hərbi xidmətə göndərilmişdir. 1994-cü ildə Kəlbəcərdə şəhid olub. Abbasov Elçin də başqa qeyrətli oğullarımız kimi doğma Vətənə bağlı bir gənc idi. Mənfur erməni quldurlarının haqsız iddiaları, xalqımıza qarşı etdikləri qeyri-qanuni hərəkətlər bir azərbaycanlı kimi onu da rahat buraxmadı. O, Vətənin hər qarış torpağını öz canından üstün tutdu. Elə Vətən yolunda, ana-bacıların isməti yolunda da qurban getdi.

# Abbasov Mübariz Əfqan oğlu



Abbasov Mübariz Əfqan oğlu 1969-cu ildə yanvar ayının 10-da Gədəbəy rayonunun Arıqıran kəndində anadan ol-muşdu. Orta məktəbi bitirdikdən sonra hərbi xidmətə çağı-rılmışdı. Sonra Bakıya işləməyə gəlmişdi. 1993-cü ilin yanvarında torpaqlarımızı müdafiə etmək üçün könüllü olaraq cəbhəyə yollanmışdı. Ağdərə bölgəsində kəndlərimizin azad edilməsi uğrunda gedən döyüşlərdə xüsusi şücaətlər göstərmişdi. Kəlbəcər, Füzuli, Ağdam, Tərtər, Murovdağ döyüş bölgələrində azğın düşmənlə ölüm-dirim savaşlarında zabit heyətinin və əsgər yoldaşlarının ehtiramını

qazanmış, sıra-vilikdən mühəndis istehkam qurğularının taqım komandiri vəzifəsinə irəli çəkilmişdi. 1993-cü ilin sonlarında Kəlbəcər uğrunda döyüşlərdə Mübariz altı erməni quldurunu məhv etmiş, onların silahını və bir minaaxataran cihazı gətirib hissəyə təhvil vermişdi. Bir dəfə də döyüş yoldaşlarını və dəstə komandirini mühasirədən çıxara bilməsi onun əsl qəhrəmanlığından xəbər verirdi. Bu vaxt Mübariz yaralanmışdı. Üç ay hərbi qospitalda müalicə olunduqdan sonra yenə öz hərbi hissəsinə qayıtmışdı. Sonra mahir döyüşçü 3 aylıq zabit kursuna göndərilmiş, gizir rütbəsində taqım komandiri kimi hərbi hissəyə qayıtmışdı. Mübariz Abbasov 1995-ci il martın 1-də növbəti tapşırığı yerinə yetirərkən döyüşçü dostu Namiqlə birlikdə həlak oldu.

## ABBASOV RAFİQ İBRAHİM OĞLU

Abbasov Rafiq İbrahim oğlu 1970-ci ildə Gədəbəy rayonunun Heriknaz kəndində dünyaya göz açıb. Heriknaz kəndində boya-başa çatıb. 1990-cı ildə könüllü olaraq, Vətənimizin torpaqlarını qorumaq üçün Qarabağ bölgəsinə yola düşüb. 1993-cü ildə qəhrəmancasına həlak olmuşdur.

## ABBASOV RİZVAN QƏŞƏM OĞLU



Abbasov Rizvan Qəşəm oğlu 1975-ci ildə Gədəbəy rayonunun Pərizamanlı kəndində anadan olmuşdur. O, 1982-ci ildə Pərizamanlı kənd orta məktəbinin birinci sinfinə getmişdir. 1992-ci ildə həmin məktəbin onuncu sinfini bitirmişdir. 1993-cü ildə hərbi xidmətə

çağırılmışdır. 22 aprel 1994-cü ildə Ağdərə bölgəsində torpaqlarımızın müdafiəsi zamanı şəhid olmuşdur.

## ABDULLAYEV ASİF İSA OĞLU



Abdullayev Asif İsa oğlu 15 dekabr 1975-ci ildə Gədəbəy rayonunun Arıqdam kəndində anadan olub. 1991-ci ildə öz kəndlərində orta məktəbi bitirib, Gədəbəy rayon texniki məktəbinə daxil olub. Həmin il oranı bitirdikdən sonra 1992-ci il yanvarın 28-də 15 saylı əmrə əsasən N saylı hərbi hissədə xidmətdə olub. İlk döyüş yolunu Tərtər rayonunda başlayıb. 29 yanvar 1994-cu ildə "Qlobus" yüksəkliyi uğrunda gedən döyüşdə itgin düşüb.

## ABDULLAYEV FƏZAİL FİDAİL OĞLU



Abdullayev Fəzail Fidail oğlu 1977-ci ildə Gədəbəy rayonunun Gərgər kəndində anadan olub. 1981-ci ildə Gərgər kənd orta məktəbinin birinci sinfinə daxil olub, sonra isə texniki peşə məktəbində oxuyub. 28 iyun 1995-ci ildə hərbi xidmətə gedib, 6 noyabr 1995-ci ildə şəhid olub.

## Abdullayev Şərif İsaq oğlu



Abdullayev Şərif İsaq oğlu 1 yanvar 1970-ci ildə Gədəbəy rayonunun Qoşabulaq kəndində anadan olmuşdur. 1977-ci ildə Qoşabulaq kənd orta məktəbinin birinci sinfinə getmiş və

həmin məktəbin onuncu sinfini bitirmişdir. 1993-cü ildə hərbi xidmətə çağırılmışdır. 1994-cü ildə xidməti vəzifəsini yerinə yetirərkən qəhrəmancasına həlak olmuşdur.

# Abdullayev Telman Həmid oğlu



Abdullayev Telman Həmid oğlu 1962-ci ildə Gədəbəy rayonunun İnəkboğan kəndində anadan olmuşdur. 1979-cü il-də İnəkboğan kənd orta məktəbini bitirmişdir. Həmin ildə həqiqi hərbi xidmətə çağırılmış və Sovet ordusu sıralarında xidmət etmişdir. Hərbi xidmətdən döndükdən sonra ailə həyatı qurur. İki övladı dünyaya göz açır. Erməni işğalçılarının torpaqlarımıza soxulduğu bir vaxtda Telman yenidən könüllü olaraq orduya getdi. Həyat yoldaşına və övladlarına söz verdi: “mən qoymaram ki, erməni azğınları torpaqlarımızı zəbt etsin”. Əfsuslar olsun ki, Tərtər uğrunda gedən döyüşlərdə Qaranlı kəndində qəhrəmancasına həlak oldu.

# Abdullayev Yəhya Şahbaz oğlu



Abdullayev Yəhya Şahbaz oğlu 12 iyun 1972-ci ildə Gədəbəy rayonunun Hacıələkbərli kəndində anadan olmuşdur və 1979-cu ildə Dəyirmandağ kənd orta məktəbinin birinci sinfinə getmişdir. 1989-cu ildə həmin məktəbin onuncu sinfini bitirmişdir. 1991-ci ildə hərbi xidmətə çağırılmışdır. 6 avqust 1993-cü ildə Azərbaycan Respublikasının ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə Füzuli rayonunun Mənəcanatlı kəndində şəhid olmuşdur.

# Alıyev Xaləddin Mehman oğlu



Alıyev Xaləddin Mehman oğlu 1966-cı ildə Gədəbəy rayonunun Ağamalı kəndində kolxozçu ailəsində anadan ol-muşdur. 1974-cü ildə Ağamalı kənd orta məktəbinə daxil olub, 1984-cü ildə onuncu sinfi bitirmişdir. 1984-cü ildə Gədəbəy hərbi komissarlığından hərbi xidmətə çağırılmışdır. Hərbi xidmətini Novosibirsk vilayətində Daxili Qoşunlarda keçmişdir. 1986-cı ildə hərbi xidmət-dən qayıtdıqdan sonra geoloji kəşfiyyatda işləmişdir. Yağı düşmən torpaqlarımıza soxulanda o da könüllü olaraq Vətənin müdafiəsinə qoşulur. 1994-cü ildə Azərbaycan torpaqlarının bütövlüyü uğrunda gedən döyüşlərdə şəhid olmuşdur.

# ALIYEV MEHMAN İBRAHİM OĞLU



Neçə illərdir ki, igidlərimizin ölümünə göy kişnəyir, bulud ağlayır. Təbiət özü yas saxlayır, Vətən göyləri qara bu-ludlarını qara örpək edib çəkib başına. Oğullarımız “şəhidlik” adlı zirvəyə qalxır, qərənfillərimiz şəhid qanına boyanır, ulu dağlarımız top-tüfəng səsinə vərdiş edə-edə özünün dağ ömrünü yaşayır. Bu gün döyüşən rayonlarımızdan biri də Gədəbəydir. Gözəlliklər məskəni bu torpaq müharibə başlanandan onlarca şəhid verib. Döyüşçülərimizin bugünkü qələbə yürüşündə onların da mühüm rolu var. 1969-cu ildə rayonun Qaradağ kəndində anadan olmuş Alıyev Mehman İbrahim oğlu da onların sırasında layiqli yer tutur… 1990-cı ildə ordudan tərxis olunan M. Alıyev erməni quldurlarına qarşı aparılan döyüşlərdə iştirak etmiş, 1992-ci ilin yanvar ayından isə Xüsusi Təyinatlı Milis Batalyonun tərkibində vuruşmuşdur. Ağdərədə, Goranboyda, Şəmkirdə rus qoşunlarının çıxarılmasında iştirak edib. İvanovka, Mutudərə, Mormor, Göyəmli, Başkənd yaşayış məntəqələrinin erməni quldurlarından təmizlənməsində fəal iştirakı olub, onlarca erməni faşistini o dünyalıq edib. Mehman cəsur kəşfiyyatçı idi. O, ilk dəfə Qırmızı Bazar kəndi yaxınlığında əsil kəşfiyyatçı kimi sınaqdan çıxıb. Burada bir neçə erməni quldutu

öldürüb. 800-dən artıq oğurlanmış qoyunun geri qaytarılmasında iştirak edib. Ümumiyyətlə, onun kəşfiyyatdan əliboş qayıtdığı olmayıb. Ona görə də yoldaşları bu cəsur oğlana “REMBO” adı vermişdilər. Mormor əməliyyatı igid kəşfiyyatçının son döyüşü oldu. Mormor camaatı Mehmanın ölümündən cəmi iki saat qabaq ayaqları altında qurban kəsmişdilər. Qurban ətindən yeyib, döyüşə girmişdi. Milli Qəhrəman İsgəndərin postundakı topla 3 erməni mövqeyini darmadağın etmişdi. İsgəndər Mehmanın mahir atıcı olduğunu görüb ona 1-ci posta getməyi məsləhət gördü. Çünki orada qabiliyyətini daha sərbəst nümayiş etdirə bilərdi. Birinci postdan Mehmanın əlilə erməni mövqelərinə dalbadal mərmilər yağmağa başladı… Döyüş meydanına süküt çökmüşdü. Bundan istifadə edən Mehman mərmi göndərməsi üçün İsgəndərə xəbər vermək üçün onun yanına yollanmağı qərara aldı. Bu məqsədlə mövqeyini tərk etdi. Namərd düşmən tülkü kimi fürsət gözləyirmiş. Güllə onun ürəyindən dəydi. Mübariz Hacıyev dostunun meyidini döyüş mövqeyindən uzaqlaşdırdı. Beləcə bir igid də itirdik. Arzuları ürəyində qalan, əməl-lərisə daim yaşayacaq bir igid! Mehman musiqini çox sevirdi. Axırıncı dəfə kənddə olanda qarmonu dilləndirib əsgər marşı çalmışdı. Geri dönəndə isə ömür-gün yoldaşı Tünzaləyə aldığı parçanı verib, “Özünə xalat tikdir, 10 günə qayıdıram” – demişdi. Mehman Tünzalənin əynində təzə xalatı görmədi. Düşmən gülləsi ona vədini yerinə yetirməyə imkan vermədi. Oğlu Elsevər, yolunu gözlədiyi körpəsi, bünövrəsini qoyduğu, lakin ömrü kimi yarımçıq qalmış ev, böyük bir elat qəribsəyir Mehman üçün…

## ALIYEV MƏZAHİR HƏSƏN OĞLU



1951-ci ildə Gədəbəy rayonunun Daryurd kəndində doğulub. Primorsk vilayətində hərbi xidmətdə olub. Əfqan müharibəsinin iştirakçısıdır. Ordudan qayıtdıqdan sonra Dəllər hərbi hissəsində qulluq edib. Gədəbəy torpaqlarının müdafiəsində – Başkənd, Kaftar, “Keçəldağ, Örükdaş əməliyyatlarında qəhrəmanlıqla döyüşüb. Kəşfiyyat üzrə tağım komandiri idi. Bacarığı, insanpərvərliyi ilə hərbçilər arasında ad-san qazanmışdı. Ən çətin əməliyyatları ona tapşırırdılar. Dəfələrlə ölümlə üz-üzə gəlmişdi. Bir addım da geri

çəkilməmişdi. “Arxa Vətəndir, geriyə yol yoxdur” – onun şüarı beləydi. Silah dostları onu “Qurd Cəbrayıl” ləqəbi ilə çağırırdılar. Bu da təsadüfi deyildi. İgidliyinə, mərdliyinə görə ona bu ləqəbi vermişdilər. Qələbə eşqi ilə döyüşürdü Məzahir. O günü görmək isə cəsur kəşfiyyatçıya qismət olmadı. 1993-cü il aprel ayının 18-də qəhrəmancasına həlak oldu. Yeddi övladı böyüyür. Məzahir az yaşadı. Amma öz sözünü deyə bildi. Az müddətdə qəhrəman səviyyəsinə yüksəldi. Belə az, lakin mənalı ömür yaşayanlar isə ölmür, əbədiyyətə qovuşurlar. Allah rəhmət eləsin!

# Alıyev Sərxan Novruz oğlu



Alıyev Sərxan Novruz oğlu iyunun 1-də 1974-cü ildə Gədəbəy rayonun Düzrəsullu kəndində anadan olmuşdur. Düzrəsullu kənd orta məktəbinin birinci sinfinə 1981-ci ildə getmiş və 1991-ci ildə həmin məktəbin onuncu sinfini bitirmişdir. 1992-ci ildə Azərbaycan Ordusu sıralarına hərbi xidmətə çağırılmışdır. Bir neçə döyüşdə iştrak edən

Sərxan sonuncu döyüşdə itgin düşmüşdür. Sərxanla uşaqlıqdan bir həyətdə böyüdüyümə görə onunla qardaş kimi olmuşuq. Sərxan çox sakit oğlan idi. Yaxşı yadımdadır, Sərxan əsgəri xidmətə gedəndən sonra qardaşım Sarvanla görüş üçün yanına getmişdik. Güləzidə hərbi hissədəydi. Həmin vaxt mənə dedi ki, döyüş bölgəsinə getmək istəyirəm. 1992-ci ilin yay ayları idi. Dedim ki, Sərxan, bəlkə Gədəbəydə, Şınıxda döyüşəsən erməni quldurları ilə. 0, mənə gülümsünüb dedi: “Azərbaycan torpağının hər bir qarışı mənim üçün doğmadır, əzizdir, ona görə də hara göndərsələr ora gedəcəm”. Bir az sonra Sərxanın xəbəri Füzuli rayonunun Bəhmənli, Əhmədbəyli, Kürd Mahmudlu kəndlərindən gəlirdi. Sərxan bir neçə ağır döyüşlərdən keçmişdi. Minaatan idi. Erməni quldurlarının 2 tankını 1 kamaz maşınını necə cəsarətlə partlatmasını tağım komandiri danışanda biz nə qədər fərəh hissi keçirdik. Lakin 1993-cü ilin avqust ayında Sərxanın itgin xəbəri bizi çox sarsıtdı. Sərxan Kürd Mahmudlu kəndində gedən ağır döyüşlərin birində itkin düşmüşdü. Atalar yaxşı deyiblər: “Ata qəlbi dağlardan yüksək, ana qəlbi dəryalardan dərindr”. Nina xala böyük təskinliklə bildirdi ki, təki Vətənimiz, doğma torpaqlarımız, yağı düşmənlərdən azad edilsin.

# Alıyev Müzənfər İsrafil oğlu



Alıyev Müzənfər İsrafil oğlu 1943-cü ildə Gədəbəy r-nun Hacılar kəndində anadan olmuşdur. 1961-ci ildə Hacılar kənd orta məktəbinin 10-cu sinifini bitirib. 1962-ci ildə hərbi xidmətdə gedib. 1965-ci ildə hərbi xidməti

başa vurub. 1965-ci ildən 1984-cü ilə qədər Hacılar kolxozunda işləmişdir. 1993-cü ildən 30 yanvar 1994-cü ilə qədər könüllü hərbi xidmətdə olmuşdur. 30 yanvar 1994-cü il tarixdə xidməti vəzifəsini yerinə yetirərkən Qaravəlilər kəndində sərhəddə ermənilər tərəfindən vurulub şəhid olmuşdur. Qabil Müzənfər oğlunun söhəbəti: – Mən hərbi xidməti Mingəçevir şəhərində çəkmişəm. Atam həlak olanda 16 yaşımda idim. Atam düşmənə qarşı sona qədər döyüşdü. Mən də axır qanıma qədər öz doğma torpağımı qoruyacağam. Hal-hazırda mən və mənim ailəm sərhəddə yaşayırıq. Heç vaxt atamın şəhidliyini və atama dövlət tərəfindən verilən yüksək qiyməti unutmayacam.

# Allahverdiyev İsmayıl Məhəmməd oğlu



Haqqında söz açmaq yaman çətin gəldi mənə, İsmayıl! Atan Məhəmməd dayının da, qardaşın Qulunun da söhbətlərini böyük həyəcanla dinlədim. İçin-için hıçqırdım, göz yaşlarımı qəlbimə axıtdım. Amma qürurdan köksüm qabardı: elimin oğlu xalqımın adına layiq olduğunu əməliylə sübut etdi. Sağlığında heç vaxt müraciət etməmişdim sənə. Heç tanış da deyildik. İndi isə ruhuna tuturam üzümü. Özüm də təəccüb edirəm, necə oldu ki, birdən-birə beləcə isnişdim sənin ruhuna? Doğmalaşdım, dostlaşdım? Bəlkə sənin tank komandiri olduğunu bildiyim üçün? Axı bizim Nizami, şəhid-şair Nizami Aydın da T-72-nin tank komandiri idi. Sənin silahdaşın, məsləkdaşın olmuşdu. Sənin hekayətin onun hekayətini xatırlatdı mənə. Bəlkə də sənin böyük hissetmə, duyma qabiliyyətini bildiyim üçün idi.  Səkkiz-on yaşı olardı, anbardakı dəmir tirin üstünə adını, doğum tarixini – 1974, daha sonra isə "1994" yazmışdı. Soruşdum ki, bu 74-ü başa düşdük, bəs 94 nədir? Cavab verdi ki, nə bilim, elə qəfildən ağlıma gəldi, mən də yazdım, silməyin, qoyun qalsın... Düzü keçən söhbətdir, bir də üstünə qayıtmadım, indiyədək də durur o yazı. Sən demə balam hələ körpəliyindən başdaşına yazılacaq tarixdən xəbərdarmış, – söyləyirdi atan. Tanrıdan gələn vəhy idimi o tarixcə sənə? Nə güclü duyumun varmış, İsmayıl. Necə oldu ki, belə duyumla düşmən gülləsindən yayına bilmədin? "Azərbaycan Ordusu" qəzetindəki bölgə müxbiri İbrahim Məsimoğlunun "Ön cəbhədən reportaj"ından oxuyuram: "Tuşlayıcı operator (Səməd Orucov) qabağı görə bilmir. Çünki yol burula-burula uzanır. Tank komandiri İsmayıl Allahverdiyev döngənin o biri üzünü yoxlamaq üçün çölə çıxır. Yüyürərək döngəyə çatır. Yolun ortasına çıxır və

düşmən tankı ilə üz-üzə gəlir. Nə geri çəkilə bilir, nə də kənara. Pulemyot gülləsi ilə onu ayağından yaralayırlar. Yola yıxılan İsmayıl çətinliklə sürünür. Son nəfəsdə vəziyyəti hava telefonu ilə dostlarına çatdırmağa macal tapır”. Dörd rəqəmi kimi yanvar ayı da taleyinə iri hərflərlə yazıldı, qardaş. 5 yanvar 1974-cü ildə sən təkcə Gədəbəy rayonunun Arıqıran kəndi üçün doğuldunsa, 31 yanvar 1994-cü ildə bütöv bir əbədiyyət üçün doğuldun. Qardaşın Qulunu da dinlədim: – 1992-ci ilin iyun ayında cəbhəyə yola düşdü. İlk döyüş yolu Laçın bölgəsindən başlandı. Laçının süqutundan sonra evə gəlmişdi. Rayon komissarlığına ərizə yazıb təzədən cəbhəyə yollandı. Bu dəfə Kəlbəcər istiqamətdə döyüşə başladı. Elə həmin rayonun Qamışlı kəndində şəhid oldu. Qəribə xasiyyəti vardı. Həmişə tələsirdi. Evdə də, işdə də, elə döyüşdə də tələsirdi. “Mən mütləq qəhrəman olacam” – deyir-di. Arzusu hərbiçi olmaq idi... Duymuşdunmu ömrünün gödəkliyini? Arzularını, əməllərini həyata keçirmək imkanının az olduğunu? Hər yerdə, hər işdə tələsməyini özgə hara yozum? Məhəmməd dayı dözmür: – 7 oğlum var. Adama isnişməyi, mehribanlığı ilə İsmayıl hamısından seçilirdi. Hələ o kənddə qocalı-cavanlı bir kəs onun dilindən inciməmişdi. Arabir cəbhə bölgəsinə ge-dirdim. Yoldaşları ilə söhbət edirdim. Həmişə haqqında xoş sözlər eşidirdim. Bütün dostları razılıq edirdi. Xəyyam Əsədovun dəstəsində vuruşurdu. Axırıncı dəfə getdim yanına. Dedilər “pozitsiya”dadır. Gözləmədim. Dedim sağ-salamatdır, bu mənə bəsdir. Görəndə ürəyim dözmür, mən də pis oluram, elə uşağın özü də. Bir dəfə dedim ki, döyüşün də öz qaydası var. Çalış həmişə ortada gedəsən. Nə geri qalma, nə də irəlidə getmə. İncidi sözümdən: “Demək canım əzizdir, Vətən yox? ” – dedi. Anası 86-cı ildə xəstəlikdən vəfat edib. Nənəsi olub ana-bacısı”. Sən demə səni qoynuna alan təkcə Vətən

torpağı deyilmiş, İsmayıl. Həm də Qaytan ananın isti qucağı imiş. Qızım, qardaşım, qızım. Taleyin acığına sağlığında duyduğun ana nisgilinin əvəzini çıx. Şəkillərinə baxıram. Dostun Elşad iki əllə qolundan bərk-bərk yapışıb, sanki qorumaq istəyir səni qandan-qadadan. Amma qismətin qarşısına durmaq mümkünmü?

# Allahverdiyev Namiq İsmayıl oğlu



Şəhid Allahverdiyev Namiq İsmayıl oğlu 08.12.1961-ci ildə Gədəbəy rayonunda anadan olmuşdur. 1971-ci il tarix-də Gədəbəy rayon N. K. Krupskaya adına Gədəbəy şəhər orta məktəbinə getmişdir. 1981-ci ildə həmin məktəbi bitirmişdi. 1982-84-cü illərdə hərbi xidmətdə olmuşdur. Əsgəri xidmətdən qayıtdıqdan sonra S.M.Kirov adına maşınqayırma zavodunda işə qəbul olunmuş, həmin zavodda işləyə-işləyə Azərbaycan Neft Akademiyası İnstitutunun qiyabi şöbəsinə qəbul olunmuşdu. Azərbaycan Respublikası Prezidenti H. Əliyevin televiziya və radio vasitəsilə xalqa müraciətindən sonra Allah-verdiyev Namiq İsmayıl oğlu öz ərizəsi ilə könüllü olaraq Azərbaycan Respublikasınm suverenliyi uğurunda gedən döyüşlərdə iştirak etmək üçün Azərbaycan Respublikasının Silahlı Qüvvələri sıralarına yola düşür. 7 may 1994-cü ildə Tərtər rayonun Marquşevan kəndi uğurunda gedən döyüşlərdə qəhrəmancasına şəhid olur. Hazırda qəbri Gədəbəy rayonunun “Şəhidlər xiyabanında”dır. Bir ocağın atası idi Namiq. Bir oğul özünü torpağa qurban verdi, əvəzində bir şəhid də qazandıq. Sağ ikənmi bu ömür şərəfliydi, yoxsa şəhid ikənmi? Bilmirəm. Hər ikisində ünvan birdir – Allahverdiyev Namiq İsmayıl oğlu. Azərbaycan Jurnalistlər birliyinin üzvü Etibar Əliyevin dedikləri: “Namiqlə on il bir məktəbdə oxumuşduq. Çox vaxtlarımız bir keçib. Elə buna görə də günahsız ölümü göynədir məni. Bir qəhrəman kimi ölməyinə isə qibtə edirəm”.

Vətən kimindir? Vətəndaşının. O adamların ki, onlar Vətənin hər daşını müqəddəs bilirlər. Nemət yetirirlər, həm də qoruyurlar. Vuruşub şəhid olmağı da bacarırlar. Namiq də bu qəbildən olan adamlardan idi. Vətənin vətəndaş duyğusunu yaşadan oğlu idi.

Övladlıq payını yaşayıb, yenicə isindirdiyi bir ocağın atası idi. Yaşamağa həvəs, hər şeyə dözüm onda nə qədər güclü idi, ilahi! Onunla rayondamı, Bakıdamı görüşəndə cavanlığın özünəxas qayğılarından, sabahından söhbət edərdik. Gördüyümüz ədalətsizliklərin təsirini bölüşərdik. Bu anlarda onun zarafatları karımıza gələrdi. Qeybətdən, gileydən uzaq olan Namiqin səbri, hər çətinliyə dözmək əzmi elə bil onun Tanrıdan tapıntısı idi. Namiqin ali məktəbə qəbul olunduğu vaxtlar idi. Görüş-dük. Sevincindən susmurdu. Sabahın mühəndisi olacağını vəchlə söyləyirdi. Çəkdiyi əziyyətləri, üzləşdiyi naqislikləri qəbul edib, tələbə şirinliyinə bağışlayırdı. Nəyəsə acığı da varsa, hər şeyə ağız açmamaq onun xüsusiyyətinə hakim idi. Namiqin sağ ikən də, indi də bəzəkli ifadələrə, təriflərə ehtiyacı olmayıb. Yaxşı şagird olub, oxumağında da, hərəkətində də. Yaxşı əsgər olub, nümunəvi xidmət edib. Əmin-amanlıqda da, darayaqda da Vətənə faydalı olduğunu sübut edib. Cəsur döyüşçü xidmətinə görə onu Bakıdakı Şəhidlər Xiyabanında dəfn etmək istəyirdilər… İsmayıl dayının, Lilpar xalanın qəhərlənən vaxtıdır. Oğul arxa itiriblər. Amma bir müqəddəs ad qazanıblar. Onların övladı hamımızın torpağı uğrunda şəhid olub, hamıya doğma olub. Allah sənə rəhmət eləsin, Namiq! Bircə özünə güvənən bir cavan kimi, dünyanın yaxşılığını əməlində yaşadan gözəl bir insan kimi, uğrunda ölüb torpağı Vətən edən bir şəhid kimi!

# Allahverdiyev Zülfüqar İsrafil oğlu



Tale burulğanı! Aman bu burulğanın əlindən! Dad aman! Bir kimsəyə arzulamasanız da kasıb daxmanızın qapısını vaxtsız-vədəsiz döydü bu burulğan, Zülfüqar! Bu amansız burulğan əvvəl atanız İsrafil müəllimi – ömrünü-gününü jurnalist sənətinə bağlamış qələm yoldaşınızı, sözlü-söhbətli bir el adamını qopardı ailənizdən. Onun indi lal-dinməz olmuş, yaxın bir neçə il əvvəl öz həzin nəğmələri ilə sizi ovunduran sazına baxmaq bəlkə də hamıdan ağır idi evdə səninçün. Çünki həssas, yanımcıl ürəyin vardı. Evdə də, çöldə də hamının sevincinə, kədərinə şərik olmağı bacarırdın. Elə bu

səbəbdən də hələ atanın sağlığında ailənizin ağır yükünü tam bərkiməmiş çiyinlərinə götürəndə “of” demədin. Evə qazanc gətirdin. Sevindirdin hamını. Tale bunu da çox görürmüş, sən demə, ailənizə. Onun amansız burulğanı səni çox tez haqladı, qardaş! Özü də atanın ilinə bir neçə ay qalmış haqladı. Adam heç cür inanmaq istəmir sənin yoxluğuna!.. Bu qısa ömründə nə gün gördün axı?! Əsgəri xidmətini 1991-ci ildə başa vurmuşdun. Çətin günlər alnına yazılıbmış elə bil. Əskərlik illərində də Rusiyanın Uzaq Şərq torpaqlarında dözmüsən hər əzaba. Evdəkilərin ürəyini parçalamamaq üçün bircə cümlədə yazmamısan düşdüyün çətinliklərdən. Ta buraxılış alıb gələnəcən burda xəbəri olmayıb heç kəsin taleyinə yazılanlardan. İndi qonşuların, dostların, tay-tuşların danışır bu barədə. Sənin yoxluğunun yanğısında yana-yana, qovrula-qovrula. Bu qədər ağırlığı həyatın isti soyuğuna hələ öyrəşməmiş ürəyində necə daşıyırdın? Özün hamının dərdini çəkə-çəkə öz dərdini bir kimsə ilə bölməyə razı olmurdun!.. Deyirlər, ölüm yaxşıları seçir, Zülfüqar! Yoxsa doğrudanmı haqlıdır o?! Sən hələ yaşamalıydın, qardaş, yaşamalıydın...Çətin günlər səni vaxtından tez yetkinləşdirmiş, kişiləşdirmişdi. Yəqin sən bu səbəbdən idi ki, doğma Azərbaycanımızın – müstəqillik yoluna kövrək qədəmlərini qoyan res-publikamızın başına açılan oyunlarla, torpaqlarımızın erməni qaniçənlərinin açıq təcavüzünə məruz qalmasıyla barışa bilmirdin. Vətən qeyrəti, torpaq təəssübkeşliyi rahat buraxmırdı səni. Buraxmazdı da! Çünki bu obaya, bu elə qırılmaz tellərlə bağlanmışdın. Deyirdin: “Dünyada yaxşı yerlər çoxdur. Amma Azərbaycan hər yerdən yaxşıdır, hələ bu meşəli, dağlı Gədəbəy!.. “Bu torpaqda qızışdırılan erməni-müsəlman davasında Vətən oğullarının, qızlarının günahsız tökülən qanlarına biganə qala

bilmirdin. Çünki əqidən sağlam, bütöv idi. Deyirdin: “Sən də getmə, mən də getməyim, o da getməsin, bəs bu torpağı kim qorusun?”. Anan Elfridadan, qohumlardan xəlvət rayon hərbi komissarlığından çağırış vərəqi aldın. Qoynunda böyüdüyün bu dağlarda da döyüşə bilərdin – Gədəbəy də sərhəd zonasıdır axı. Amma Qarabağı seçdin. Görünür, ürəyin daha qaynar, daha odlu nöqtələr üçün döyünürdü. Xocalı soyqırımı, gözəl Şuşanın, Laçının əldən verilməsi, Ağdərədə, Ağdamda gedən ağır döyüşlər sənə yamanca əsər eləmişdi. Əvvəl uğurlu Ağdərə döyüşlərində iştirak etdin, sonra ən ağır günlərində Ağdama üz tutdun. Neçə döyüş bölgəsinin, neçə kəndin azad olunmasında cəsarətlə vuruşdun. Elə Ağdamda Abdalgülablı kəndi uğrunda gedən ağır döyüşlərdə də... Bütün bunlardan çox adam xəbərsizdir. Amma sənin şəhid matəminə axışıb gəliblər. Yox, yox, sənin daşa dönmüş cəsədini göz yaşları içində gətirmiş əsgər yoldaşlarının söyləmələrinə görə “əla döyüşçü olmusan, cılız bədəninə sıxdığın ağır qranatamyotdan açdığın bircə atəş belə hədəfdən yan keçmirmiş”. Yəqin yağı düşmən elə buna görə səni tez-tez snayper atəşinə tuturmuş, Zülfüqar! Hətta səni dəfələrlə ölüm saçan güllələrdən qoruyan “zirehli köynəyin” olubmuş, qardaş. Amma oktyabrm 19-u gecəsi... Namərd gülləsi axır ki, səni də haqladı birdən. Sinəndən dəyən bircə güllə kürəyini parçaladı... Şəhidlik zirvəsinə daha bir ad əbədi həkk olundu: Allahverdiyev Zülfüqar İsrafil oğlu! Bir qədər əvvəl torpaq sahəsi almaq istəyirdin. Ev-eşik sahibi olmaq, ailə qurmaq, yurd salmaq arzusundaydın!.. Amma çata bilmədin bu istəyinə, bu arzuna. Şəhidlik zirvəsini ondan da üstün tutdun.

Cəmi ikicə ay döyüşə bildin. Arada ananla görüşə gələndə yerini dəyişməyə cəhd etsələr də razılaşmadın: “Hökmən getməliyəm,

yerim Qarabağdadır, orada vəziyyət çox çətindir” – dedin. Bu məsləkinlə də özünə bir əbədiyyət heykəli ucaltdın. Gədəbəy şəhəri belə dəfn mərasimi görməmişdi, Zülfüqar! Evinizdən Şəhidlər xiyabanınacan 3-4 kilometrlik yola maşın karvanına qoşulan insan axını – insan seli bütöv bir elin, bir obanın sənə dərin ehtiramını, tükənməz məhəbbətini nümayiş etdirirdi. Üstündə hər ürəkdən eyni bir nida qopurdu: Rahat yat, qardaş! Qəbrin nurla dolsun!

# Allahyarov Habil Tahir oğlu



19 noyabr 1973-cü ildə Gədəbəy rayonunun Soyuqbulaq kəndində anadan olmuşdur. 1980-cı ildə məktəbə daxil olub. 1990-ci ildə Soyuqbulaq kənd orta məktəbinin 10-cu sinifni bitirib. 1992-ci ildə əsgəri xidmətə çağırılıb. Gədəbəy rayonunun Şınıx bölgəsində döyüşüb və 30 sentyabr 1992-ci ildə şəhid olub. Hazırda Soyuqbulaq kənd orta məktəbi Habil Allahyarovun adını daşıyır. Son görüş. 1992-ci il avqust ayının 27-si. Səhər tezdən Soyuqbulaq kəndindən rayonumuzun Şınıx bölgəsindəki dö-yüşçülərimizə yardım aparan maşın yola düşür. Hərbi ştabın qarşısında yardım maşınını, kənd rəhbərlərini və sakinləri alay komandiri Cahangir Rüstəmov qarşılayır: – Siz çox xoş gəlmisiniz, bu xeyirxahlığınız, döyüş bölgələrimizə baş çəkməyiniz igidlərimizin qəlbini dağa döndərir. Çünki bizim mənəvi köməyə böyük ehtiyacımız var. Hər xeyirxah gəlişin, hər xeyirxah görüşün özünün mənəvi köməyi var əsgərlərimizdən ötrü. Maşını Örükdaş məntəqəsinə sürün. Yardımlarınızı oradakı döyüşçülərə çatdırın. Bir az da dərd-sərləri ilə maraqlanın, söhbət edin…

… Əsgərlər deyə-gülə süfrə arxasına əyləşdilər. Ev-eşikdə yemək yeməyin ləzzəti başqadırsa, doğmalarınla açıq havada asiyalılarsa yağı bardaş qurub çörək kəsməksə tamam başqa aləmdir, ləzzəti də heç ələ keçən deyil. Şirin söz-söhbətlər, şən zarafatlar hamısı qarışmışdı bir-birinə. Günorta yeməyi beləcə başa çatdı. Habil atası ilə görüşsə də ev-eşikdən, qohum-əqrabadan ətraflı xəbər tuta bilməmişdi. Doğrudur, darıxmırdı ev üçün, qohumlar üçün. Çünki elə oğlanlarla dostlaşmışdı ki, bu beş ayda heç

darıxmağa macal tapmamışdı. Hələ qohumu Şəmistan da onunla bir rotada xidmət edirdi. Əsgər dostu Qasım Habilin xətrini daha çox istəyirdi. Bir yerdə növbədə durar, keçmişi-gələcəyi vərəqləyər, arzuların şirin ümmanına baş vurardılar… … Ata-oğul bir az aralıda xeyli söhbət etdilər, dərdləşdilər. Tahir kişi oğluna dəyanətli olmağı, kişi kimi xidmət etməyi tapşırdı. –A bala, –dedi, –torpaqlarımıza necə ki, düşmən cayna-ğı uzanır, siz bu murdar ermənilərin əllərini kəsməlisiniz. Sübut etməlisiniz ki, yada-yağıya bu torpaqda yer yoxdur. Bu qədər dözdük. İrəvanı, Zəngəzuru, Şəmşəddini, bir sözlə, ərazilərimizin çoxunu verdik onlara. İndi də “Böyük Ermənistan” yaratmaq xülyası quduzlaşdırıb bu dığaları. Daha düşünmürlər ki, bu torpağın yiyələri var, onun bir qarışmı belə düşmən tapdağmda qoymazlar…Avqust ayının 30-da, düşmən tərəf Krasnoselo rayonu istiqamətdən mövqelərimizi yenə də güclü qrad, top atəşinə tutmuşdular. Döyüşçülərimiz cavab atəşi açmalı oldular. Quduzlar günün birinci yarısında aldıqları sərrast cavabdan sonra susdular. Bu, döyüşçülərimizə hazırlığı bir az da artırmaq üçün imkan vermişdi. Komandirlərin çəkdikləri plan üzrə hərə bir iş görürdü… Günortadan təzəcə adlamış quldurlar Örükdaşdakı gözətçi məntəqəmizə yenidən güclü atəş açmağa başladılar. Habil üç döyüşçü dostu ilə bir postda dayanmışdı. Yaxınlıqda partlayan mərmi qəlpələri Habili və iki döyüşçü dostunu haqladı. Beləliklə, üç igid – üç oğul itirdi bu torpaq. Üç ailə yasa, qəm-qüssəyə batdı o gün… Habilin döyüşçü dostu Qasımın dedikləri: “Qorxmaz oğul idi Habil. Tez-tez dərdləşərdik. Mən onu çox sınağa çəkərdim. Yoxlayırdım ki, görüm döyüşdən çəkinirmi? Amma bir neçə əməliyyatda birlikdə iştirak edəndən sonra gördüm ki, yox, yanılmışam, Habil əsil döyüşçüdür. Özünü elə də-yanətli, elə soyuqqanlı aparır ki… Kəşfiyyata da birlikdə çox getmişəm onunla. İnanın ki, düşmən postuna lap iyirmi-otuz metr qalana kimi getmişik. Mən onun heç bir artıq hərəkətinin şahidi olmamışam. Gözlərində həmişə quldurla-rı didib-parçalamaq, məhv etmək ifadələri oxumuşam. Onun dediyi: “Qardaş, gün gələcək el-obada kiçik yaşlı uşaqlar bizə qibtə ilə baxacaqlar. Deyəcəklər ki, o gördüyünüz qocalar vaxtilə ermənilərlə müharibədə döyüşən kişilərdir…” Bu kəlmələri həmişə xatırlayacağam.Habil kimi oğullar sayəsində Vətən – Vətən olur, bu torpaq öz müqəddəsliyini saxlayır. Allah sənə rəhmət eləsin, qardaş! Qəbrin nurla dolsun!

## Aslanov İlyas Nəsrəddin oğlu



Aslanov İlyas Nəsrəddin oğlu 1962-ci ildə Gədəbəy rayonunun Arabaçı kənd sovetliyinin Fərzalı kəndində anadan olub. İsalı kənd orta məktəbini qurtarmışdı. 2 övlad atası olan İlyas yaxşı ailə başçısı idi. O, Bakının Sabunçu rayonunda yaşayırdı. 1992-ci ildə könüllü olaraq cəbhəyə yollandı. Qarabağ uğrunda gedən döyüşlərdə itgin düşdü. 13 avqust 1993-cü ildə ölümü haqqında şəhadətnamə yazılıb.

# Bağırov Rafiq Möhvət oğlu



Bağırov Rafiq Möhvət oğlu 1970-ci ildə Gədəbəy rayonunun Poladlı kənd İƏV-nin Hacıalılar kəndində kolxozçu ailəsində anadan olmuşdur. 1987-ci ildə şəhid E.İsgəndərov adına Hacıalılar kənd orta məktəbini bitirmişdir. 1988-1990-cı ildə Sovet ordusu sıralarında həqiqi hərbi xidməti başa vurmuş və 1991-ci ildə torpaqlarımızın düşmən tərəfindən təmizlənməsi uğrunda döyüşlərə atılmışdı. İgidliyi ilə tanınan R.Bağırov Ağdərə uğrunda gedən döyüşlərdə ən mübariz döyüşçülərdən biri olmuşdur. Bir dəfə düşmən qüvvələri ilə üz-üzə

dayanaraq döyüş yoldaşlarının mühasirədən çıxmasına imkan yaratmışdır. Ermənilərin torpaq iddiaları Gədəbəy torpaqlarında qanlı qarşıdurmaya çevriləndə Rafiq də özünü müdafiə dəstələrinə qoşulmuşdu. Milli ordumuz yaradılarkən onun ilk əsgərlərindən biri olmuşdur. Dəfələrlə Şınıx bölgəsində gedən döyüşlərdə iştirak etmişdir. Başkəndin quldurlardan təmizlənməsində cəsarətlə fərqlənən Rafiq son döyüşlərin birində 28 fevral 1993-cü ildə güllə yarasından qəhrəmancasına həlak olmuşdur. Ana Vətənin, doğma diyarın, müqəddəs torpağın azadlığı, şərəfi yolunda canını fəda edən qəhrəmanlara eşq olsun!

## Bağırov Təhməz Qəhrəman oğlu



1971-ci ildə Gədəbəy rayonunun Nəriman kəndində anadan olub. Orta məktəbi qurtarıb. Fədakarlığı, qoçaqlığı ilə yaddaşlara həkk olunub. ... Dağların qızıl qönçələrə bələnməsi Təhməzin ürəyini yerindən oynatdı. Güllər durna qatarına bənzəyirdi. Təhməz istədi güllərin içi ilə addımlasın, amma qıymadı. Həsrət-həsrət güllərə baxdı. Öz-özünə pıçıldadı: “Görəsən, dünyada belə cənnət diyar varmı?” Və birdən yadına Xocalı hadisəsi düşdü. Gözəllik də, dağların görkəmli də Təhməzin yadından çıxdı. Qət etdi ki, hərbi komissarlığa müraciət etsin. Polkovnikə yaxınlaşdı: – Məni döyüş bölgələrinə göndərin, – dedi. Polkovnik bu yaraşıqlı oğlanı xeyli süzüb fikrə getdi. Rəsmi görkəm alıb dedi: – Evinizə gedin, lazım olanda çağıracağıq. Təhməz narazılıq etdi: – Vətən təhlükədədir. Siz məni yoldan qaytarırsınız. Mən Vətənə indi lazımam. Xahiş edirəm məni döyüşən hissəyə göndərəsiniz. Polkovnik əlini Təhməzin çiyninə qoyub

qayğılı-qayğılı dilləndi: – Halal olsun sənə, oğul, atanın, ananın çörəyi! Sən igid oğlansan…. Üç gündən sonra Təhməz Ağdərəyə yola düşdü. Burada torpaq da, daş da od tutub yanırdı. Ermənilər Ağdərəni əllərində saxlamaq üçün bütün qüvvələrindən istifadə edir, tankların və piyada döyüş maşınlarının gücündən istifadə edirdilər. Milli ordumuz isə nəyin bahasına olursa olsun Ağdərəni almağı qarşısına məqsəd qoymuşdu. Burada ölüm-dirim müharibəsi gedirdi. Yer-göy lərzəyə gəlmişdi. Təhməzin döyüşdüyü rotanın əsgərləri sol cinahdan düşmənin piyada bölüyünün qarşısında mərdliklə dayanmışdılar. Düşmən əsgərləri hərəkət edə bilmirdilər. Təhməz ön cərgədə döyüşürdü. O, düşmənin başına od-alov yağdırırdı. Yoldaşları hər dəfə: Özünü gözlə, – desələr də Təhməz Ağdərəyə can atırdı. "Qüllənin alınması" əməliyyatı başa çatmaq üzrə idi. Yoldaşlarnı da döyüşə ruhlandırırdı Təhməz. Düşmən snayperi bu çevik, bacarıqlı Azərbaycan oğlunu sıradan çıxartmaq üçün xeyli əlləşdi. Qəfil açılan güllə onun yanar ürəyini əbədilik susdurdu. Az vaxt ərzində neçə-neçə döyüşlərdə iştirak etmişdi. Onun ürəyində nə səngərlərin soyuğu, nə də düşmən güllə-sinə tuş gəlmək vardı. Oddan-alovdan keçib cəsur bir döyüşçü olmuşdu. Ağdərədə qeyrət döyüşündə əbədiyyətə qovuşdu Təhməz. Onun ölüm xəbərinə əzizləri inanmadı… "Belə cəsur oğul ölə bilməz"! – dedilər. "Şəhidlər xiyabanı"nda Gədəbəyin bir igidi də əbədiyyətə qovuşdu. Hər gün məzarı üstünə təzə-tər qərənfillər qoyulur. Həmin güllər Təhməzin nakam ömrünə göz yaşı tökür, ağı deyir. Təhməz 21 il yaşadı. Qalan ömrünü isə gələcək nəsillərə, bugünkü balalara bağışladı. Başını uca tut, Qəhrəman kişi, oğlun Təhməz ölməyib. Torpaqlarımızın azadlığı yolunda şəhid olub. Belə şəhid oğullar isə Vətən, xalq yolunda döyüşdükləri üçün ölmür, əbədiyyətə qovuşurlar!

# Bayramov Aydın Bayram oğlu



Bayramov Aydm Bayram oğlu 1968-ci ildə Gədəbəy rayonunun Arabaçı kəndində anadan olub. Zamanlı kənd orta məktəbini bitirdikdən sonra hərbi xidmətə yollanmışdır. 2 il hərbi xidmətdə olmuşdur. O, Gədəbəy rayon Qaçqınlar idarəsində sürücü vəzifəsində işləyirdi. Həmişə hərbiçilərlə əlaqə saxlayır, onlara silah və yemək daşıyırdı. 1993-cü ildə hərbiçilərə sursat daşıyan zaman erməni quldurları tərəfindən atılan güllənin qurbanı olmuşdur. Subay idi.

# Bayramov Elçin Zülfüqar oğlu



Bayramov Elçin Zülfüqar oğlu 1974-cü il aprel aymm 14 də Gədəbəy rayonunun Rüstəm Əliyev kəndində anadan olmuşdur. O, böyüdükcə arzuları da böyüyürdü. Onun arzusu təyyarəçi olmaq idi. Elçingil ailədə beş uşaq olub. İki qardaş, üç bacı. Elçin orta məktəbi qurtardıqdan sonra orduya yola düşmüşdür. Bu vaxt erməni faşistləri Azərbaycana qarşı işğalçılıq siyasəti yeridir, torpaqları zəbt etmək istəyirdi. Elçin torpaqlarımızı və ana-bacılarımızın namusunu qorumaq üçün yağı düşmənə qarşı mübarizəyə hər an hazır idi. 0, həmişə müharibənin ön cəbhəsində vuruşurdu. Elçin pulemyotçu idi. Batalyonları Canyataq-gülyataq, Ağdam, Ağdərə və Çıldıran döyüşlərində düşmənə zərbə vurublar. Axırıncı döyüşləri Çıldıranda olub. Elçingilin batalyonları mühasirəyə düşdü. Bir neçə gün düşmənə qarşı qəhrəmanlıqla vuruşdular. Batalyonun bir neçə əsgəri ilə birgə Elçin də əsir düşüb.

# Bayramov İsmayıl Abbas oğlu



Bayramov İsmayıl Abbas oğlu 1969-cu ildə anadan ol-muşdur. 1976-cı ildə Novoivanovka kənd orta məktəbinə getmiş, 1986-cı ildə həmin məktəbi bitirib, Qazax baytarlıq texnikomuna

daxil olmuşdur; 1988-ci ildə hərbi xidmətə çağırılmış və 1990-cı ildə xidməti bitirdikdən sonra Gəncə şəhərində 861-ci alayda praporşik işləyirdi. 1992-ci ilin yanvar ayında evlənmişdi. Evləndikdən 8 ay sonra 1992-ci ilin sentyabr ayında doğma kəndinə növbəti ezamiyətə gön-dərilmiş və Novoİvanovka kəndi ermənilər tərəfindən atəşə tutulan zaman ağır qəlpə yarasından həlak olmuşdur.

# Bayraməliyev İlqar İsrafil oğlu



Bayraməliyev İlqar İsrafil oğlu 10 oktyabr 1973-cü ildə Gədəbəy rayonunun Yenikənd kəndində anadan olmuşdur. Bayraməliyev İlqar ibtidai sinfi Əlinağılar kənd məktə-bində oxumuş, natamam orta məktəbi Yenikənd məktəbində bitirmişdir. Bayraməliyev İlqar 1 sentyabr 1989-cu ildə Gədəbəy şəhəri 148 nömrəli TPM-ə daxil olmuş, 25 iyun 1992-ci ildə geniş profilli traktorçu peşəsi üzrə tam kursu bitirmişdir. İlqar 12 dekabr 1993-cü ildə hərbi xidmətə çağırılmışdır. O, Gədəbəy rayonunda yerləşən hərbi hissədə xidmət etmişdir. Orduda xidməti zamanı şəxsi heyətin dərin hörmətini qazanmış, komandirlərin və rəislərin verdiyi bütün tapşırıqları vaxtlı-vaxtında, layiqincə yerinə yetirmişdi. Həmin hissədə çavuş rütbəsi almışdır. İlqar Gədəbəyin Şınıx bölgəsində gedən bütün döyüşlərdə: Mutudərənin alınmasında, Əyriyol əməliyyatında və başqa bir çox əməliyyatlarda əsil qəhrəmanlıq göstərmişdir. Bayraməliyev İlqar 5

aprel 1994-cü ildə Azərbaycan Respublikasınm ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə şə-hid olmuşdur.

# Cabbarov Kamal Adil oğlu



Cabbarov Kamal Adil oğlu 1967-ci ildə Ermənistan Respublikası Basarkeçər rayonunun Kəsəmən kəndində anadan olub. 1974-cü ildə Kəsəmən kənd orta məktəbinin 1-ci sinfinə daxil olub. 1984-cü ildə həmin məktəbin 10-cu sinfini bitirib. 1985-ci ildə Sovet ordusu sıralarına həqiqi hərbi xidmətə çağırılıb. 1987-ci ildə hərbi xidmətini başa vurub doğma kəndinə qayıdıb. 1988-ci ildə üzdəniraq ermənilərin etnik tənzimləmə siyasəti nəticəsində yurdundan qovulmuşdur. 1988-ci ildən Gədəbəy rayonunun Novosaratovka kəndində sığınacaq tapmışdır. 20 yanvar Bakı faciəsinin iştirakçısı olmuş və ağır yaralanmışdır. Müalicə olduqdan sonra könüllü olaraq Gədəbəy rayonunun polis dəstəsinə yazılmışdır. Gədəbəy rayonunun Mutudərə, Mormor, İvanovka kəndləri uğrunda gedən döyüşlərin və Başkənd kəndinin alınmasının iştirakçısı olmuşdur. Kamalın axırıncı

şücaəti Hörükdaş yüksəkliyinin alınması uğrunda gedən döyüşdə olmuşdur.

# Cəfərov Cəmşid Oruc oğlu



Cəfərov Cəmşid Oruc oğlu 18 yanvar 1973-cü il tarixdə Gədəbəy rayonu İsalı Sovetliyinin Mutudərə kəndində kolxozçu ailəsində anadan olmuşdur. 1980-ci ildə Mutudərə kənd məktəbinin 1-ci sinifinə daxil olmuş və 1989-cu ildə həmin məktəbin IX sinfini bitirmişdir.

1991-ci ilin may ayında hərbi xidmətə yola düşmüşdür. Hərbi xidmətdə olarkən Azərbaycan torpaqları uğrunda gedən döyüşlərdə iştirak etmiş və 1994-cu il iyun ayının 28-də döyüş zamanı mərdliklə vuruşaraq şəhid olmuşdur.

# Cəfərov Hüseyin Səməd oğlu



Cəfərov Hüseyn Səməd oğlu 1915-ci ildə Gədəbəy rayo-nunun Göyəlli kəndində doğulmuşdur.1941-ci ildən 1945-ci ilə qədər müharibədə olmuşdur. Müharibədən gələndən sonra Yamən Həmid qızı ilə evlənmişdir. Bir oğlanları olmuşdur. O da 13 yanvar 1980-ci ildə vəfat etmişdir.

13 mart 1990-cı ildə Cəfərov Hüseyn Səməd oğlu meşə-dən odun gətirərkən ermənilər onu diri tutaraq Krasno-selski rayonuna aparmışlar. Bu günə qədər Hüseyn Səməd oğlu itgin düşmüşdür.

# Cəfərov İrəddin Firudin oğlu



Cəfərov İrrədin Firudin oğlu 1962-ci ildə Poladlı sovetliyi-nin Kəlaman kəndində anadan olmuşdur. 1969-76-cı illərdə Xacallar kənd orta

məktəbində, sonra 1980-cı ildə Böyük Qaramurad məktəbində təhsilini davam etdirib. Həmin məktəbi bitirib ordu sıralarına getmişdir. 1983-cü ildə hərbi xidmətini başa vurduqdan sonra. Bakı şəhərində peşə məktəbinə daxil olmuşdur. 1984-cü ildən Bakı radio zavodunda işləyib. Oradan könüllü olaraq 1 noyabr 1992-ci ildə Ağdərə rayonuna döyüş cəbhəsinə getmiş, mərdliklə vuruşmuşdur. 1993-ci ilin 11 fev-ralında Ağdərə rayonunun Qoxlu kəndində şəhid olmuşdur. 1993-cü il fevral ayının 11-i quldurlar Ağdərə rayonu istiqamətdə döyüşçülərimizin güclü əks həmləsi ilə qarşılaşmışdılar. Bu, daşnaq tör-töküntülərini daha da azğınlaşdırmış, gözlərində od parlamışdı. Vəhşilikləri qələniə sığmayan, əməlləri dünya tarixinə qara ləkə kimi yazılan dığalar Allahdan belə qorxmadan bildiklərini tutmağa çalışırdılar. Vaqauz (Qozlu) kəndi ətrafında döyüşən əsgərlərimiz nahar fasiləsinə toplaşmışdılar. Tabur komandiri Həsənxan Səfərov döyüşçülərə kabab çəkməyi göstəriş vermişdi. Odun yığan kim, ocaq çatan kim hərə bir işin axarında idi. Nahar hazır olanda komandir əsgərlərdən ən çox xətrini istədiyi İrəddin Cəfərovu səslədi: – Bu dəfə səninlə yanaşı nahar etmək istəyirəm, eloğlu, sən qoçaq oğlansan, – dedi. Komandirin fikrindən razı qalan İrəddin onunla yanaşı əyləşdi. Beləcə nahar etdilər. Birdən, sonuncu tikəni götürən İrəddin üzünü komandirə tərəf çevirib:

– Yoldaş komandir, vəziyyət nə isə heç məni açmır. Deyəsən bu son naharımız, doğrusu mənim üçün son tikə olacaq. Bir daha nahara birlikdə əyləşməyəcəyik.

H. Səfərov igid döyüşçünün bu sözlərini zarafat kimi qəbul etdi və tikəni onun əlindən alıb: – Bununla sən öləcəksənsə qoy mən yeyib ölüm – dedi. Lakin İrəddin təkid və inadından dönməyib öz tikəsini

geriyə qaytarıb yedi...– Hücum əmri verdim – H. Səfərov deyir – atışma gələn tərəfi nəzarətə alıb, düşmənin mövqelərini susdurduq. Əsgərlərdən İrəddin Cəfərov, Nazim Mehdiyev (Ağcabədi rayonu, Sarcalı kəndi), Aydın İsmayılov (Gədəbəy rayonu, Dəyirman-dağ kəndi), Cavanşir Mehdiyev (Gəncə şəhəri – 1993-cü ilin aprelində şəhid olub. Allah rəhmət eləsin! ) daha çox fərqləndilər. Əməliyyatı davam etdirirdik. Birdən binokulla bizdən 1,5 kilometr aralı məsafədə bir əsgəri ağacdan asıb soyan vəhşiləri görəndə dünya başıma fırlandı. İrəddin də irəli yeriyib binoklla həmin mənzərəyə baxdı və üzünü mənə tərəf çevirəndə onun sifətindən, gözlərindən duydum ki, quldurların bu hərəkəti onu möhkəm sarsıdıb. Birdən o, aşağı əyilmiş başını dik qaldırdı, şax dayanıb gözlərimin içinə baxdı və dilləndi: - Yoldaş komandir, əgər bu yolda ölüm varsa yenə məni qorxutmur. Əməliyyat planı hazırlamaq gecdir. Həmin quldurları məhv etməliyəm. Əgər mən o vəhşiləri məhv edib ölsəm valideynlərimə də çatdırarsınız ağlamasınlar. Siz dostlarım da onun kimi.  Orada indi quldurlar yəqin ki, pusquda dayanıblar. Səni vura bilərlər, deyə onu əməliyyat hazırlanana qədər fikrindən daşındırmağa çalışdımsa da mümkün olmadı, Tabur komandiri söhbətini belə davam etdirir. O, sürətlə hərəkət edib məsafənin yarısına qədərini sürünə-sürünə irəlilədi. Sonra kiçik bir daşın arxasında beş-on dəqiqəlik dayanıb, özünü toxtadı. Çoxları onun bu hərəkətini görüb sanki donmuşdular. Sonra avtomatını nişanlayıb tək-tək güllələrlə hər üç quldurU bir andaca yerə sərdi. Və həmin an gözlərimə inana bilmirəm, o, ayağa qalxıb ucadan qışqırdı: Daha ölümdən də qorxum yoxdur! Dəhşətə gəldim, onu heç cür işarə ilə başa sala bilmədiyim üçün özümü möhkəm qınadım. Lakin artıq gec idi. Arxadan atılan düşmən snayperi onun qəlbini susdurdu. Bu

hadisə gündüz saat dörd radələrində baş verdi. Üç saat düşmənlə əlbəyaxa döyüşdən sonra biz onun meyidini götürə bildik... Vətənini, torpağını, xalqını övladlarını öz canından artıq sevən bir igid, bir qəhrəman itirdi o gün Gədəbəy torpağı. Yox, yox, qatı düşmən, düşünmə ki, sən bununla bu xalqın övladlarının qəddini əyə biləcəksən. Xeyr! Bu heç zaman mümkün deyil! Odlar diyarı adlanan bu torpağa bu gün bir dən atsan sabah onun neçə-neçə cücərtiləri göyərəcək, yerdən baş qaldıracaq. Yadın, yağının bu torpağın müqəddəsliyinə uzanan murdar caynaqlarmı kəsəcək, onu birdəfəlik məhv edəcək. Qeyd etməliyik ki, İ.Cəfərov 1992-ci il sentyabrm 15-də könüllü olaraq ordu hissəsinə yollanıb. Tərtər batalyonunda xidmət edib. Burada da bir erməni zabiti öldürüb. Onun silahını öz xalqına – ermənilərə tərəf çevirib. Burada erməni zabitinin silahı üstə yaranan dedi-qodu onu narazı salıb. Sonra başqa hərbi hissədə Ağdərə rayonunun Umudlu, Çıldıran, Drambon, Aterk, Arqumer və s. kəndləri uğrunda gedən döyüşlərdə qəhrəmanlıq göstərib, çoxlarina örnək olub...İrəddin 1962-ci ildə Poladlı sovetliyinin Kəlaman kəndində doğulmuşdu. Ailənin böyük oğlu idi. Firidun dayının, Bəsti xalanın göz işığıydı. Özündən kiçik qardaş-bacıları Zirəddinin, Lətifənin, Təranənin, Maarifin, Şəlalənin, Maisin və bu el-obanm əziziydi. Ölümü ilə ölməzliyə, şəhidliyi ilə müqəddəsliyə qovuşdu. İndi şəhidlik zirvəsindən boylanır onun ruhu doğma torpağa, onun saf sularına, durna gözlü bulaqlarına, axar-baxarlı dağına, dərəsinə. Bəli, son tikəsini özü yeyib, ölümünü özü bilən ölməz oğullar xalqımızın qəlbində özlərinə əbədi yurd salmış qəhrəmanlardır. Belə oğullarla öyünməyə haqqın var, ana torpaq, doğma diyar!

# Cəfərov Vüqar Rəcəb oğlu



Cəfərov Vüqar Rəcəb oğlu 3 mart 1975-ci ildə Gədəbəy rayonunun Düzyurd kəndində anadan olmuşdur. 1982-ci il-də Düzyurd kənd orta məktəbinə daxil olmuş, oranı 1991-ci ildə bitirmişdir. 1993-cü ildə hərbi xidmətə yollanmış, 1994-cü ildə Ağdam-Tərtər-Goranboy bölgəsində gedən şiddətli döyüşlərdə şəhid olmuşdur. Düzyurd kəndində 1997-çi ildə yaradılmış kəndli ferması Vüqarın adını daşıyır.

# Cəfərov Sərraf Zaman oğlu



Cəfərov Sərraf Zaman oğlu Gədəbəy rayonunun Çobankənd kəndində 1975-ci ildə anadan olub. Çobankənd orta məktəbini bitirib. 1993-cü ildə Ermənistanla sərhəddə hərbicilərə kömək edərkən ermənilər tərəfindən odlu silahla qətlə yetirilmişdir.

# Cəfərova Zəkiyyə Vüqar qızı



Cəfərova Zəkiyə Vüqar qızı 1986-cı il fevralın 20-də Gədəbəy rayonunun Novasaratovka

kəndində anadan olmuşdur. 6 avqust 1992-ci ildə ermənilər tərəfindən atılan mərmi qəlpəsindən həlak olmuşdur.

## Cəlilov Əsgər Xəlil oğlu



Cəlilov Əsgər Xəlil oğlu 1936-cı ildə Gədəbəy rayonunun Mutudərə kəndində kolxozçu ailəsində anadan olmuşdur. Uşaqlıq illərini yoxsulluq içərisində keçirmişdir. Yaşının yetkinlik çağlarında kolxozda fəhləlik etmişdir. 1981-ci ildən Gədəbəy rayon rabitə qovşağının İsalı poçt şöbəsində poçtalyon işləmişdir. İşlədiyi müddətdə əhalinin dərin hörmətini qazanmışdır. 1990-cı il 20 yanvar hadisələrindən on gün sonra xidməti vəzifəsini yerinə yetirərkən erməni quldurları tərəfindən faciəli surətdə 5 nəfər rabitə işçisi ilə birlikdə qətlə yetirilmişdir.

## Çopurov Bəhmən Səyyad oğlu



Çopurov Bəhmən Səyyad oğlu 1968-ci ildə fevralın 16-da Gədəbəy rayonunun Arabaçı kəndində anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra 1986-88-ci illərdə Sovet Ordusu sıralarında xidmət edib. Vətənə qayıtdıqdan sonra könüllü olaraq doğma torpaqlarımızın müdafiəsinə qalxıb. 1993-cü il 24 aprel… O gün Arabaçı kəndi sevinc içində idi. Bəhmənin toyu idi. Həmin gün Səyyad kişinin, Əminə ananın da sevincinin həddi-hüdudu yox idi. Oğul toyu görmək onların çoxdankı arzusu idi. Bəli, həmin gün bəxtəvər ailə həyatının ilk günü, həsrətin vüsala qovuşduğu anın həyəcanı onun cavan, saf qəlbini intizarla əsdirirdi. Amma, sən demə fələk başqa oyun oynayacaqmış. Bu səadət dolu ayların ömrü gödək ola-caqmış. Bu xoşbəxtlik ilğımmm o üzündə qara yellər əsirmiş. Səyyad dayı: “Bəhmən bir yerdə qərar tutmazdı. Dəfələrlə əsgərlərə çörək, silah-sursat aparardı. Əsgərlər də, artıq ona öyrəşmişdilər. Bəhmənin yolunu intizarla gözləyirdilər”. 1993-cü ilin boz payız günlərinin birində, 18 oktyabrda onun ömür kitabının son səhifəsi yazıldı. Bəhmən “Sarı qaya” adlanan yerdə minaya düşərək əbədi olaraq gözlərini yumdu. Bu həyatla vidalaşarkən son dəfə olaraq özündən sonra dünyaya gələcək balaca körpəsini düşündü. İndi Bəhmənin oğlu balaca Bəhmən igid atasının yarımçıq ömrünü yaşayır. Allah sənə rəhmət etsin, Bəhmən! Ömrün uzun olsun, balaca Bəhmən!

## Çopurov Mahal İslam oğlu



Çopurov Mahal İslam oğlu 1977-ci ilin mart ayında Arabaçı kəndində anadan olmuşdur. 1995-ci il mayın 25-də hərbi xidmətə çağırılmışdır. İlk hərbi təlimi Pirikküşküldə 3 ay olmuşdur. Sonra 701 № li hərbi hissədə xidmət etmişdir. 1997-ci il fevralm 24-də Yeddiqardaş dağına hərbi sursat apararkən 3 yoldaşı ilə qar uçqununa düşmüş və şəhid olmuşdur.

## Əhmədov Məhəmmədəli İsa oğlu



Əhmədov Məhəmmədəli İsa oğlu 1933-cü ildə yanvarm 11-də Gədəbəy rayonunun Göyəlli kəndində anadan olub. 1951-ci ildə Sovet ordusu sıralarında xidmətə yola düşüb. 1953-cü ildə xidmətini başa vurub doğma kəndə qayıdıb. Həmin vaxtdan ailə qurub. Kolxozda fəhlə

işləmişdir. Dörd övladı var. 1993-cü ilin 5 avqustunda hərbiçilərə silah-sursat apararkən erməni gülləsinə tuş gəlmişdir.

## Ələkbərov Aqil Mayıl oğlu



Ələkbərov Aqil Mayıl oğlu 1973-cü ildə Gədəbəy rayonu-nun Şəkərbəy kəndində anadan olub. 1990-ci ildə Şəkərbəy kənd orta məktəbini bitirmişdir. 1992-ci ildə hərbi xidmətə getmişdir. 1994-cü ildə Kəlbəcərdə şəhid olmuşdur.

“OT KÖKÜ ÜSTƏ BİTƏR!..”

Min illərin sığnağından keçib, süzgəcindən süzülüb ulu dədələrin bu müdrik kəlamı: “Ot kökü üstə bitər”. Onun babaları da 1917-1918-ci illərdə – ermənilərin növbəti fitnə törətmək istədikləri dövrdə quldurlara qan uddurmuşlar. Gorları nurla dolsun Cavad, Allahverdi, Hüseynqulu, İsmayil, Aslan, Əmiraslan, Manaf babaların! Şükür adlı bir pir olmuşa qoşulub saysız erməni vasil ediblər cəhənnəmə, Şəkərbəy kəndi yaxınlığında.
Aqil Ələkbərov da babalarına oxşamışdı qəhrəmanlıqda, qoçaqlıqda, mərdlikdə. Rayonumuzdakı “N” hərbi hissəsində xidmət edirdi. Cəsur döyüşçü idi. Türk oğlu İsgəndərin sevimli döyüşçü dostu olmuşdu. Ona etibar edirdi texnika-nı, silahı bu məşhur el qəhrəmanı. 1992-ci ilin aprel ayından xidməti borcunu şərəflə, kişi

kimi yerinə yetirirdi. Zabit Yunis Hüseynov onun barəsin-də heyfslənə-heyfslənə, sonsuz kədərlə danışır:  1994-cü il yanvar ayının 21-də Kəlbəcərin müdafiəsinə göndərildik. Döyüş planını Yanşaq sərhəd məntəqəsində aldıq. Zod yolu istiqamətində döyüşməli idik. Məqsəd bu yolu bağlamaq idi. Təkə qaya deyilən yerdə (Lev kəndi yaxınlığında) quldurları mühasirəyə saldıq. Ayın 24-də gündüz saat 11-12 radələrində Aqil Ələkbərov öz dəstəsi ilə (bölmə komandirinin köməkçisi kimi) döyüşdə bir neçə erməni məhv etdi. Düşmən güclü texnika ilə döyüşə girdi. Onda Aqil və döyüşçü dostları sağ cinahdan quldurlara muqavimət göstərməyə başladılar. İgid soydaşımız düşmən BMP-sini vurmaq məqsədilə qranatomyot silahı ilə yerini dəyişdi. Lakin bundan duyuq düşən alçaqlar BMP-dən atəş açdılar. Sağ qolundan, döş qəfəsindən və çiyin nahiyəsindən aldığı ağır yaralar Aqili bizimlə, ana torpaqla vidalaşmağa məcbur etdi… Atası Mayıl kişi deyir ki, böyrəkləri xəstə idi, müalicə olunmağa göndərdilər, amma o razılaşmadı:  Axı nə üçün kimsə mənə baş girələyirsən, ya canmı qoruyursan deməlidir. Torpaqlarımız azad olunanacan döyüşəcəyəm deyirdi… Bəli, Aqil Odlar yurdunun belə igidlərindən, sayılıb, seçilən oğullarından idi. Mutudərənin müdafiəsində, Başkənd, Sarıyal, Keçəldağ əməliyyatlarında fəal iştirak etmiş, qulluq etdiyi hissənin əsgər və komandirləri arasında bacarıqlı döyüşçü kimi tanınmışdı… Döyüşçü dostları Vaqif Cəfərov, İsrayıl Məmmədov, Fidail Həsənov onun ömür yolunu əsgərlərimizə örnək bilirlər… Sevindirici odur ki, hazırda Aqil Ələkbərovun adı əbədiləşdirilib. Şəkərbəy kənd orta məktəbi bu qəhrəman soydaşımızın adını daşıyır. Biz də bütün şəhidlərə və Aqilə qəbriniz nurla dolsun, müqəddəs Vətən keşikçiləri deyirik.

## Ələkbərov Mehriban Şahbaz oğlu



Ələkbərov Mehriban Şahbaz oğlu 25 iyul 1973-cü ildə Gədəbəy rayonunun Dəyirmandağ sovetliyinin Sarıköynək kəndində anadan olmuşdur. 1990-cı ildə Dəyirmandağ orta məktəbinin onuncu sinfini bitirmişdir. 1991-ci ildə Gədəbəyin hərbi komissarlığından hərbi xidmətə getmişdir. 20 sentyabr 1992-ci ildə hərbi xidmətini yerinə yetirərkən Şınıx kəndində erməni qəsbkarlarına qarşı gedən döyüşdə qəhrəmancasına həlak olmuşdur.

## Ələsov Ədəd Mayıl oğlu



Ələsov Ədəd Mayıl oğlu 3 aprel 1960-cı ildə Gədəbəy rayonunun Arıqdam kəndində anadan olub. O, 1967-ci ildə həmin kənddə orta məktəbə getmişdir. 1978-ci ildə orta məktəbi bitirib, 1978-80-ci illərdə Rusiyada hərbi xidmətdə olub. 1990-cı ildə Azərbaycan

hərbi xidmətinə çağırılıb. İlk döyüş yolunu Tərtərdən başlayıb. 1994-cü il fevralın 28-də itgin xəbəri gəlib. Evli idi. İki oğlu var.

# Əliyev İlham Müzəffər oğlu



Əliyev İlham Müzəffər oğlu 1961-ci ildə Gədəbəy ray-onunun Gədəbəy qəsəbəsində anadan olmuşdur. 1978-ci ildə Gədəbəy şəhər 1 saylı orta məktəbi bitirmişdir. 1980-82 ci illərdə hərbi xidmətdə olmuşdur.
1983-cü ilin iyun ayında milis orqanlarında işə qəbul olunmuş, İsmayıllı və Gədəbəy rayon daxili işlər şöbəsinin nəzdindəki mühafizə bölmələrində milis işləmişdir. 1987-ci ildə SSRİ Daxili İşlər Nazirliyinin Bryansk şəhərindəki xüsusi milis məktəbini bitirmişdir. Milis məktəbində oxuyarkən Çernobıl qəzasının aradan qaldırlmasında iştirak etmişdir. Milis əlaçısı adına layiq görülmüşdür. 1987-ci ildə Gədəbəy rayon DİŞ-də sahə müvəkkili vəzifəsində, 1989-cu ildən 1990-cı ilin avqust ayna kimi Gəncə Şəhər DİŞ-də sahə inspektoru, sonra isə cinayət axtarış bölməsində əməliyyat müvəkkili vəzifəsində çahşmışdır. İlham müəllim ailəsində anadan olmuşdur.
Atası Əliyev Müzəffər İdris oğlu Gədəbəy şəhərində icra nümayəndəsi işləmişdir. Qardaşı Əliyev Nazim Müzəffər oğlu orduda xidmət etmişdir, Gədəbəy şəhər polis şöbəsində cinayət axtarış bölməsində baş əməliyyat müvəkkili vəzifəsində çalışır. Polis mayorudur. İlham sevib-sevilib. 1990-cı ilin aprel ayında sevdiyi qızla, Rəna ilə evlənib. 4 ay ailə həyatı yaşayıb. Özündən sonra oğlu dünyaya gəlib. Atasının adını daşıyır. İlham Əliyev 19 avqust 1990-cı ildə Gəncə polis şöbəsindən Qazax rayonunun Ermənistanla həmsərhəd Aşağı Əskipara kəndində köməyə göndərilmişdi. Erməni yaraqlıları ilə qəhrəmanlıqla vuruşaraq düşməni itgiyə məruz qoymuş və həmin döyüşdə yaralanaraq həlak olmuşdur. Gədəbəy şəhər qəbristanlığında dəfn edilib. Ölümündən sonra “Qırmızı ulduz” ordeninə layiq görülüb. Oxuduğu 1 saylı orta məktəbə onun adı

verilmiş və məktəbin həyətində büstü qoyulmuşdur. Adına küçə var. Azərbaycanın ilk 4 Milli qəhrəmanlarından biridir.

# Əliyev Fəxrəddin Firudin oğlu



Əliyev Fəxrəddin Firudin oğlu 1953-cü ildə Gədəbəy rayonunun Arabaçı kəndində anadan olmuşdur. Zamanlı kənd orta məktəbini bitirdikdən sonra Daşkəsən peşə məktəbində oxumuş, 1971-ci ildə hərbi xidmətə çağırılmış, 3 il hərbi xidmətdə olmuşdur. Sonralar "1 May" sovxozunda uzun müddət sürücü vəzifəsində işləmişdir. 1992-93-cü illərdə Krasnı rayonundan Şınıx bölgəsinə hücüm edilərkən Fəx-rəddin Əliyev xalqın köməyinə çatmış, körpələri, qadınları öz maşınında lazımı yerlərə çatdırmışdır. O, kənddə hamının sevimlisi olmuşdur. Nəhayət 1997-ci il sentyabrın 15-də erməni gülləsinə tuş gəlmişdir. 5 övlad atası idi.Şəhid Fəxrəddin Əliyevin əziz xatirəsinə Seymurun gözlərini qəmli görəndə, Dərdim təzələndi, xəyala daldım. Aynuş naləsindən, Elşad ahından, Alışdım odlara yandım, ay Fəxi! Elnura demədin sən son sözünü Gizlətdin Seymurdan yaşlı gözünü. İstədin bilməsin güllə izini, Atanın evini yıxdın, ay Fəxi! O gülən gözlərin düşəndə yada, Artacaq qəmlərim həddən ziyada, Çətinə düşəndə mən bu dünyada, Sirdaşım sənmiş qandım, ay Fəxi!  Hücum çəkib yağı düşmən gələndə, Sənin qüvvətini gücünü bildi. Elə ki, bu qəmli kədəri gördü, Güldü düşmən gözü sandım, ay Fəxi! İndi sənin sədan gör hardan gəlir? Çaylardan yüksəlir, dağlardan gəlir. Çiçəkli torpaqlar sənə baş əyir, Təbiət od tutub sandım, ay Fəxi!

ZİRVƏDƏ QALAN İGİD

... Qıpqırmızı gün çıxmışdı. Elə bil lap yayın orta ayıydı. Səpsərin meh əsirdi. Bu səpsərin sərinliyin, qıpqırmızı günəşin şüasının altında nazəndə gözəllər kimi işvəh' çəmənliklər, biçənəklər cilvələnirdi.

Onların qoynundakı lalələr sanki bu zümrüd yaşıllığa bəzək idi, tac idi, qırmızı-qırmızı naxışlardı... O, qalxmısdı zirvəyə ki, yuxarıda təsvir olunan bu əfsanəvi füsünkarlığı duysun, görsün, gözləri sevinsin, bir az ürəyi açılsın. Gəldi, gördü, ürəyi də açıldı, göz-ləri də güldü. Amma... Qəfil, namərd düşmən tərəfindən atılan güllə onu al-qana boyadı. Həmin o zümrüd laləzarlıq içində qan sel-su yerinə axdı... “Müharibə və qızılgül” adlı bir bədii film var: Savaş nəhayət başa çatır. Bu rəsmi qanunla olsa da, savaş hələ də davam edir. Gündə biri yaralanır; biri dünyasını dəyişir... Zorla pərçimləndiyimiz müharibənin “qradı”, “alazam” hələlik ulanur, susur. Atəş-kəsdir. Di gəl ki, bölgələrdən soraq gəlir: ay aman əsgər yaralandı, zabit həlak oldu... “Müharibə və qızügül” kinosunun qəhrəmam sanki tamaşaçılara deyir: “Nə qədər ki, düşmənin ağzı ovulmayıb, nə qədər ki, düşmən ölməyib ayıq, sərvaxt, ehtiyatlı olun. Yoxsa... “. Bu adi xəbərdarlıq deyil, həm də düşmən Myləsinin törədəcəyi minbir fəlakətin qarşısını vaxtında almagın hökmüdür... Fəxrəddin Firudin oğlu Əliyevi doğulub boya-başa çatdığı qədim və şöhrətli Şınıx obasında  xüsusən Arabaçı kəndində yaxşı tanıyırdılar. Elm və maarif beşiyi kimi tanınan bu yurdda onun da qismətinə sürücülük düşmüşdü. Orta məktəbi bitirmişdi, Sovetlər ordu-sunda tam hərbi borcunu vermişdi. Beş balası dörd oğlu, bir qızı vardı. Balaları sevinəndə sanırdı ki, dünya onundu. Uşaqları düşmən əsarətində qalmasın deyə özünü çox oda-suya vurmuşdu. Başkəndin düşmən yuvasından vəhşilərdən, yırtıcılardan təmizlənməsi ərəfəsində özünü atmışdı ölüm ya qalım döyüşünə. Bu kişiliyinə, qeyrətli xasiyyətinə görə hamı onun başına and içirdi. Övladları boyuna baxıb güvənirdilər... Di gəl ki, düşmən gülləsi onun ömrünə əbədi nida qoydu. Pusquya, marığa yatmış düşmən onu doğma torpağında al-qana boyadı. İndi beş körpə bala quş kimi ağız-ağıza ve-rib gecə-gündüz onu soraqlayır, onu axtanr, onu haraylayır...
Elnur: Ata hardasan, harda? Yolun nə yaman uzaqmış? Axı, dedin indicə gələcəm, bəs niyə gəlib çıxmırsan? Günahsız qanını yerdə qoymaram, ata...
Seymur: – Uşaq atasıynan öyünər! Arxamız, dayağımız, güman-ümid yerimiz idin. Gəl ata, gəl çıx, yolun nə yaman uzaq düşdü? Atasız böyüyən uşağın ürəyi çat verər, ey mənim qibləgahmı... Aynur: – Atam laylay, a laylay...
Elşad: – Atama dəyən düşmən gülləsi sinəmi dəlib-deşdi...
Elmir: – Ata ey-y-y! Səni harda axtarım, harda?! Həmişə deyərdin ki, məni soraqlasanız, o hündür dağın ətəyindəki çəmənlikdə taparsınız. Gəlirik, gəzirik, tapmırıq ki, tapmırıq... Nə qədər canımızda can var,

səni orada axtaracağıq, səni bir gün orada tapacağıq… Quş balalarını pərvazlandırmayınca dinclik bilməz. Sənin də balaların körpə, hələ ələ baxan idi, niyə onları tək, tez, tənha qoyub getdin, Fəxrəddin? Bəs onların sonrakı taleyi necə olsun? Bəs indi onlar necə "atamın canı üçün" – deyə, and içsinlər?
Başa düşürük, qardaş. Səndə günah yox idi. Günah namərd, naxələf düşmən gülləsindəydi.
Sən əbədiyyətə qovuşdun. Ruhun şad olsun. Beş övlad qoyub getmisən. Demək beş dəfə intiqamını alacaq balaların var! Onlar düşmən gülləsinə qəfil tuş gəldiyin yeridə sənin günahsız qanınıda yaşayacaq, oranı and yeri biləcəklər. "Bura Azərbaycan torpağıdır! " Bir də onlar qoymayacaq ki, zümrüd çəmənliklər solsun. Axı, dağlarda lalə gec açır!…

# Əliyev Firdovsi Muxtar oğlu



Əliyev Firdovsi Muxtar oğlu 8 sentyabr 1973-cü ildə Gə-dəbəy rayonunun Çobankənd kəndində kolxozçu ailəsində anadan olub. 1991-ci ildə orta məktəbi bitirmişdir. 1992-ci ildə Gədəbəy rayon hərbi komissarlığı tərəfindən orduya çağırılır. İki aylıq hərbi təlim keçdikdən sonra, Sarı qaya, Liman, Qaraarxı, Alagöllər, Başkənd uğrunda gedən döyüşlərdə iştirak etməyə başlayır. Mahir topçu kimi döyüş yoldaşları və komandirlər arasında nüfuz qazanır. Firdovsi 1992-ci il avqustun 8-də Liman adlanan zirvə uğrunda gedən döyüşlərdə şəhid olur. Firdovsinin xatirəsi əbədiləşdirilmişdir. Çobankənd orta məktəbi onun adını daşıyır.

* * *

Sən od oğullarının, od övladlarının qəlbində əbədi məskən salmısan, qardaş. Az yaşamısan, çox iş görmüsən. Həyatda səmərəsiz yüz illər yaşayanlardan çox yaşayacaqsan. Nə idi on doqquz yaş, nə ömürdür insan üçün bu?! Hələ sentyabrın 8-də tamam olacaqdı yaşın. Amma namərd gülləsi səni avqustun 8-i günü yaxaladı. Təkcə 8-ci günü göstərdiyin rəşadət özü tarixin bir qəhrəmanlıq səlnaməsidir. Səkkizlərdəki oxşarlıqsa nəsə açılmağa ehtiyacı olan bir sirdir bizim üçün. Nədir, yoxsa bir qısa tərcümeyi-halını yazım?! Yox, yox, qardaş, yox! Buna nə əlimdəki qələm imkan verir, nə də insafım, vicdanım. Ona görə imkan verməz ki, beş-on cümlə ilə bir el qəhrəmanı haqqında yazılacaq bir yazıya tezcə nöqtə qoyulsun. Axı, bu qısa tərcümeyi-halı oxuyan oxucu hər şeyi olduğu kimi

bilməyəcək. Neynəyə bilərik? Sənin kimi neçə-neçə oğullar itirdi bu torpaq, sən də ayrı oğuldun. Sayılıb-seçilən cavandın. Doğma Çobankənd orta məktəbində sənə Mehriban müəllimə, Cəlal müəllim dərs demişdi. Onlardan eşitmişdin, onlardan öyrənmişdin bu xalqın qəhrəmanlıq tarixini. Qaşqaqardan, Mis oğlunun yurdundan, Yalax yurddan, Kərəm qayasından, ayna sulu Soyuq bulaqdan almışdın ilhammı. Özün də bu ilhamı tay-tuşlara, doğmalara özün kimi, məhz Firdovsi kimi çatdırırdın. Meylini telli saza bağlamışdın. Durnaboğaz telli sazın pərdələri üzərində barmaqların gəzərkən sanki nakam sevgililər -Kərəm Əsliyə, Abbas Gülgəzə, Sarı aşıq Yaxşıya qovuşardı. Bu tərəfdən qoç Koroğlu dəlilərinə hay vurar, düşmən üstünə yeriyərdi. Qıratın belində Misri Qılınc qından çıxar, baş bir yana, leş bir yana tökülərdi. Başına pərvanə kimi dolanardı Lalə xala. Qəlbi qürurla döyünərdi.

– Çal, barmaqlarma qurban, ay oğul, bax belə çal! – de-yərdi Muxtar əmi!

Komandirlərin də səni bax beləcə xatırlayır. Onlarm yad-daşlarmda da məhz ayrıca iz qoymusan. 3-cü rotanm ko-mandiri baş leytenant Faiq Mahmudovun dediklərindən:– Alayımızın topçuları cəsur oğlanlardı. Avqustun beşində Firdovsi Əliyev, Vladimir Koveşnikov, Arzu Sadıqov, Azər Cavadov, Eldar Mustafayev erməni quldurlarının bir ədəd tankının sepini sərrast atəşlə vurub dağıtdılar. Ayın altısından yeddisinə keçən gecə quldurların yük dolu bir neçə avtomaşınını, xeyli canlı qüvvəsini məhv etdilər. Bir neçə əməliyyat keçirildi. Firdovsi də, dostları da böyük qəhrəmanlıq göstərdilər. Onlara tapşırılan postu qorumaqla yanaşı, növbələrlə başqa-başqa əməliyyatları həyata keçirdilər. Ayın 8-i Krasnoselodan Başkəndə gedən yolu kəsmək də onlara tapşırılmışdı. Quldurlarm güclü həmlə üçün istifadə etdikləri bir tankı əvvəl sıradan çıxardılar, sonra elə bir şərait yaratdılar ki, ikinci bir düşmən tankı mühasirəyə düşdü. Biz onu saz vəziyyətdə ələ keçirdik. Günortaya yaxınsa quldurlar Orconikidze istiqamətindən topçularımızın postunu güclü atəşə tutdular. BMP-dən atılan mərmi qəlpələrindən Firdovsi Əliyev və Vladimir Koveşnikov qəhrəmancasına həlak oldular. Mən özüm və əsgərlərimizdən Arzu Sadıqov, Azər Cavadov, Eldar Mustafayev ağır yaralandıq. Baş leytenant sözünə onu da əlavə etdi ki, hətta bizdən əvvəl 4-cü taburun komandiri haqqında təqdimatlar yazıb. Onun özü də torpaqlarımız uğrunda döyüşlərin birində şə-hid oldu. Allah rəhmət eləsin! Gərək şəhidlərimiz unudulmasın, yaddan çıxmasın. Adları əbədiləşdirilsin ki, hər an yaddaşlarda xatırlansınlar.

## Əliyev Pünhan Məhəmmədəli oğlu



Əliyev Pünhan Məhəmmədəli oğlu 20 iyul 1962-ci ildə Gədəbəy rayonunun Göyəlli kəndində anadan olub. Orta məktəbi də doğma kənddə başa vurmuşdur. İki il Sovet ordusunda xidmət etmişdir. Ordudan gələndən sonra kolxozda işləmişdir. Son illər Şınıx zonasında fəaliyyətə başlayan qaz istismarı idarəsində çalışırdı. Gədəbəydə ilk dəfə yaradılan tabura könüllü yazılanlardan öncülü Pünhan Məhəmmədəli oğlu Əliyev olmuşdur. Yəni 1 yanvar 1992-ci ildə Milli Ordu sırasında xidmətə başlamışdır. Komandanlıq tərəfindən ona bölük başçısı vəzifəsi həvalə edilmişdir. O həm də bacarıqlı kəşfiyyatçı kimi də fəaliyyət göstərirdi. Krasnoselsk-Şəmşəddin maqistral yolu daima onun nəzarəti altında (baş-çılıq etdiyi dəstənin nəzarəti) olmuşdur. 1992-ci il avqustun əvvələrində ermənilər Krasnoselsk rayonu ərazisindən Mutudərə, Qasımağalı kəndlərinə hücum etdilər. İki kəndimiz quldurlar tərəfindən dağıdıldı. Həmin vaxt P. Əliyev quldur yuvası sayılan Başkəndin erməni yaraqlılarından təmizlənməsi üçün tədbirlər görməli olur. Nəhayət erməni quldurlarının Başkənddən qovulmasında onun da xüsusi xidmətləri olmuşdur. Bir neçə dəfə kəşfiyyatçı kimi ermənilərin maşın karvanının səfini pozmuş və böyük ziyan vurmuşdur. 1993-cü ilin yanvar, fevral aylarında onun dəstəsinin “Ləzgi qayasına” hücumu, 1993-cü il aprel ayında “Keçəl dağ” əməliyyatı onun adı ilə bağlıdır. 1994-cü ilin iyununda mövqe döyüşlərində yaralı və həlak olmuş əsgərlərimizi döyüş mövqeyindən çıxarması, 1994-cü ilin fevralında Krasnoselsk-Şəmşəddin yolunda düşmənin hərbi maşınlarının məhv edilməsi, 1994-cü il avqust ayında mühasirəyə düşən 15 nəfər kəşfiyyatçımızın mühasirədən bacarıqla çıxardılması və həmin vaxt 2 erməni zabitinin murdar cəsədini gətirmiş, həmçinin qənimət kimi bir neçə döyüş sürsatı və silahını nömrəli h/hissəyə təhvil vermişdir. P. Əliyevin xidmətləri onun tabeliyində olduğu komandir tərəfindən Milli Ordunun 3-cü ildönümü münasibətilə qiymətləndirilmiş və ona gizir rütbəsi verilmişdir. 1994-cü il dekabr ayının 10-da növbəti əməliyyat zamanı P. Əliyev düşmən minasına düşərək həlak olmuşdur.

## AND YERİNƏ DÖNƏN MƏZAR

Bu il dekabrın ortalarında ağır bir xəbər yayılmışdı Gəncəbasar ellərinə. Rayonumuzdakı “N” hərbi hissənin cəsur və qorxmaz

döyüşçüsü Pünhan Məhəmmədəli oğlu Əliyev minaya düşərək həlak olmuşdur. Başı qarlı qoca dağlar, qədim və ulu yurd yerləri də ağır ellərimiz kimi öz igidinə yas tutmuşdu. Təbiət də bu dəhşətli itkiyə dözməyib təlatümə gəlmişdi. Şahə qalxan küləklər Murquz dağından üzü bu yana cövlan edərək Cavanşir, Babək, Koroğlu timsallı bir igidin ruhunu ellərimizin üstündə dolaşdırırdı. Axı, Pünhan kimi igidlər bu torpaqda hər zaman doğulmur, az-az gəlir həyata. Öz gəlişləri ilə, az və ya çox yaşamalarından asılı olmayaraq belə cəngavərlər gələcək nəsillərə örnək olacaq qəhrəmanlıq səhifələri yazaraq tariximizi zənginləşdirib, aydınlaşdırıb, onun qiymətliliyini uca göylərə yüksəldib köçürlər həyatdan. Biz, bu torpaq övladlarınınsa bir borcu qalır onların ruhu qarşısında. Bu da neçə ki, həyat var, belə cəngavələrimizi yaşatmaq, nəsillərə tanıtmaq, onun yaddaşına əbədi həkk etməkdən ibarətdir… P. Əliyevin döyüş yolu qəhrəmanlıq səhifələri ilə doludur. Onun həyatı və qəhrəmanlıq yolu barədə ancaq və ancaq geniş əsərlərdə dastanlarda söz açmaq olar. Və bununla da soydaşlarımıza mayası, canı-qanı ilə bu torpağa, bu yurda bağlı olan bir el qəhrəmanının bəlkə də ömür kitabının ancaq və ancaq müəyyən xırda detallarını çatdırmaq mümkün olar. Onun xətrini dünyalar qədər istəyirdim. Məftun idim qoçaqlığına, igidliyinə, mərdanəliyinə, qorxmazlığına. Şınıx bölgəsində onun iştirakı ilə əsgərlərimizin keçirdikləri hər bir əməliyyatlardan xoş müjdələr eşidib nə qədər sevinərdim, ilahi?! Hətta hərdənbir onun güzarı bu yerlərə düşəndə tanımayanlara göstərib:
– Məşhur el qəhrəmanımız Pünhan Əliyev bu oğlandır, – deyərdim. Özü də fəxrlə, öyünə-öyünə danışardım onun haqqında. Möhkəm dost idik. Ha çalısardım ki, döyüşən oğullarımızın öncülü kimi onu müsahibəyə, söhbətə çəkim, mümkün olmurdu. Daha doğrusu, özü buna razılıq vermirdi. Çox götür-qoydan sonra, nəhayət belə bir qənaətə gəlmişdim ki, onun haqqında şəhidlərimizə və döyüşən oğullarımıza həsr etdiyimiz ikinci kitabın önündə maraqlı və geniş bir material verək. Lakin qəlbimdən keçən arzular, içimdən axan göz yaşları ilə əvəz olundu. Onun nakam və yarımçıq ömür yolu barədə qəzetdə kiçik bir materialla çıxış etmək məcburiyyətində qaldım… Pünhan haqqında qısaca arayış: 20 iyul 1962-ci ildə Göyəlli kəndində anadan olmuşdu. Orta məktəbi də doğma kənddə başa vurmuşdu. Əvvəllər (əsgəri xidmətdən sonra) kolxozda işləmişdi. Son illər Şınıx zonasında fəaliyyətə başlayan qaz istismarı idarəsində çalışırdı. Üç qardaş, beş bacının böyüyi idi. Rayonumuzda quldurların amanını kəsən batalyonun yaradılmasında onun az xidmətləri olmayıb. Kiçik qardaşı da onunla bir səngərdə döyüşürdü…

# Əliyev Xəzail Əmir oğlu



Əliyev Xəzail Əmir oğlu 3 sentyabr 1974-cü ildə İnəkboğan sovetliyinin Köhnəqışlaq kəndində anadan olub.
7 yanvar 1993-cü il tarixində Gədəbəy rayonundan hərbi xidmətə gedib. Astara batalyonundan sonra Beyləqan zonasına döyüşə göndərilib. Şişqaya adlanan dağda yerləşmiş əsgərlərin tərkibində Martuni bölgəsindən hücum edən erməni quldurları ilə dö-yüşüb. Xəzayıl həmkəndlisi Hüseynov Nofəllə “Gecə quşu” adı ilə məşhur olan dəstədə vuruşurdu. 1994-cü il yanvarın 27-si dəstənin üzvləri komandanlıqdan “Şişqaya” yüksəkliyini tutmaq tapşırığını alırlar. Döyüşçülər gecə mövqe tutub yerlərini möhkəmləndirdilər. Səhər isə qeyri-bərabər vuruşda dəstənin 8 nəfər döyüşçüsü qətlə yetirildi. Nofəldə onlarm içərisində idi. Sonradan kəşfiyyatçılarımız onların cəsədlərini döyüş zonasından çıxara bilməmişlər. Lakin Xəzaillə itkin düşən 14 nəfərin taleyindən indiyə kimi heç bir məlumat yoxdur.

## Əmiraslanov Zahid Hümbət oğlu



Əmiraslanov Zahid Hümbət oğlu 14 fevral 1968-ci ildə Slavyanka kəndində anadan olub. 1985-ci ildə Slavyanka kənd orta məktəbini bitirib. 1986-88-ci illərdə Əfqanıstanda hərbi xidmətdə olub. 1989-cu ildən Gədəbəy rayonunun polis şöbəsində işləyib. Respublikanın ərazi bütövlüyü uğurunda gedən döyüşlərdə iştirak etmişdir və 3 avqust 1993-cü ildə həlak olmuşdur. Evli idi. İki qızı var.

## Əsgərov Famil Həbib oğlu



Əsgərov Famil Həbib oğlu 1956-ci ildə Gədəbəy rayonunun Çobankənd kəndində kolxozçu ailəsində anadan olub. 1961-ci ildə Çobankənd orta məktəbinin 1-ci sinifinə gedib, 1971-ci ildə orta məktəbi qurtarıb və həmin ildə Bakı Dövlət Universitetinin kitabxanaçılıq fakültəsinə qəbul olunub. 1975-ci ildə ali məktəbi qurtarıb. Məktəbi bitirdikdən sonra Çobankənd kənd kitabxanasının müdiri vəzifəsində işləyib. 1993-cü ildə Respublikamızın ağır vəziyyətində könüllü olaraq zabit kimi hərbi xidmətə gedib. 161 nömrəli hərbi hissədə zabit kimi çalışıb, bir çox döyüşlərdə iştirak edib. 1994-cü ildə Xocavənd uğrunda gedən döyüşdə itgin düşmüşdür.

## Əsgərov Maarif Əmir oğlu



Əsgərov Maarif Əmir oğlu 1960-cı ildə Gədəbəy rayonun Sovetabad kəndində (indiki Şurakənd kəndində) doğulub. Orta təhsili 1967-77-ci illərdə doğma kəndində alıb. Keçmiş Sovet ordusu sıralaınmdan tərxis olunduqdan sonra daimi yaşayıb-işləmək üçün Bakı şəhərinə üz tutub. 10 ilə yaxın Bakı Baştikinti idarəsinin LSTB "Bakıyaşayıştikinti" birliyinin nəzdindəki 300 nömrəli tikinti idarəsində işləyib. Əsgərov Maarif Əmir oğlu – Vətən oğludur. O bunu cəbhəyə könüllü getməyi ilə sübut etmişdir. Üç körpəsindən, ailəsindən üstün tutaraq cavan həyatını Füzuli uğrunda gedən döyüşlərdə qurban vermişdir. 1994-cü il yanvarın 13-də döyüşlərin birində isə onun Vətən eşqi ilə çırpınan qəlbini düşmən gülləsi əbədi susdurmuşdur.

## ONU UNUTMAQMI OLAR?

Maarif Əsgərov... – Ana torpaq, doğma Azərbaycan, bu da sənin müdafiən uğrunda sinəsini sipər edən bir igid, bir döyüşçünün adı, soyadı.
İndi üç körpə fidanın axşam-səhər gözləri yollarda qalıb, inana bilmirlər dağ vüqarlı bir atanın ölümünə. Necə inansınlar? İnanmaq da olmur. Zülfiyə, İlqar, Vüqar.. Adları bir-birinə yaraşan bu təzə-tər çiçəklər üstündən xəzan əsib, başlarını qəmli-qəmli tərpədirlər hər söz soruşana, hər könül oxşamaq istəyən qohuma, dosta-tanışa. İki ay ötüb bu fidanların atasız keçən ömürlərindən. İlahi, bu dərd nə qədər ağır, nə qədər dözülməz dərddir?!
Ortalığa boş xülyalarla "tullanıb" meydan sulayan bu vəhşilərin bəlasını özün ver, ulu tanrı, özün! Gorun nurla dolsun, şəhid qardaş, rahat uyu! Qanını, qisasını alacaq oğulların var. Allah qoysa İlqar da, Vüqar da gələcəkdə doğma Odlar diyarını adına, qeyrətinə layiq qoruyacaq, müdafiə edəcəklər. Biz görürük, biz içərisindəyik bu qanlı-qadalı azğın müharibənin. Təki tale yar olsun bu yolda xalqımıza. Qara bulud tez sovuşsun səmamızdan. Doğma yurdun azad, firavan dövrünün əsgərləri olsunlar İlqarla Vüqar. Qoy onlar başlarını dik tutub gəzsinlər. Müharibə alovunu, müharibə ağrısını ancaq yaşlıların dilindən eşitsinlər. -"Siz balaca uşaq idiniz, filan ildə bu hadisələr oldu... " deyən adamlar indi müharibənin ağrısı ilə yaşayan körpələrə onda beləcə izahat versinlər: – Maarif Əsgərov 1960-cı ildə rayonumuzun Sovetabat kəndində (indiki Şurakənddə) doğulub. Orta təhsilini də doğma kənddə alıb. Keçmiş Sovet ordusu sıralarından tərxis olunduqdan sonra daimi yaşayıb-işləmək üçün Bakı şəhərinə üz tutub. On ilə yaxın Bakı Baştikinti idarəsinin LSTB "Bakı yaşayıştikinti" birliyinin nəzdindəki 300 nömrəli tikinti

idarəsində işləyib. İdarənin rəisi A. Hüseynov və həmkarlar komitəsinin sədri S. Kərimovun imzaladıqları məktubdan sətirlər: …təvəqqe edir ki, işçimiz, Füzuli bölgəsində qəhrəmancasına həlak olmuş Əsgərov Maarif Əmir oğlunun oxu-duğu Gədəbəy rayonu, Sovetabad kənd orta məktəbinə onun adı verilsin”. Məktubun başqa bir yerində isə deyilir: “Əmək fəaliyyətinə 1982-ci ildən başlamışdır. On ildən artıq işlədiyi bir müəssisədə özünü müsbət cəhət-dən göstərən Əsgərov M. Ə. bütün birlik işçilərinin hörmət və rəğbətini qazana bilmişdir… Əsgərov Maarif Əmir oğlu – Vətən oğludur. O, bunu cəbhəyə könüllü getməyi ilə sübut etmişdir. Vətən torpağını, millət qeyrətini, hələ ata nəvazişindən doymayan üç körpəsindən, ailəsindən üstün tutaraq, cavan həyatını Füzuli uğrunda gedən döyüşlərdə qurban vermişdir… ”
Maarif döyüş yolunu Beyləqan rayonundan başlamış, neçə-neçə kəndin quldurlardan təmizlənməsində mətanətlə, qeyrətlə döyüşmüşdür. Bu il yanvarın 13-də döyüşlərin birində isə onun Vətən eşqi ilə çırpınan qəlbini düşmən gülləsi əbədi susdurmuşdur. Əlbəttə, qəlbağrıdan, ürəkgöynədən sətirlərin sayını istənilən qədər artırmaq olardı. Lakin zənnimizcə, buna o qədər də ehtiyac yoxdur. Yuxarıdakı məktubdan götürülən sətirlər çox şeydən soraq verir. Qaldı bizim rayon rəhbərliyinə və əlaqədar təşkilatlara sözümüz. Onlara üzümüzü tutub deyirik ki, Maarifin ailəsini, körpələrini unutmasınlar. Bu şəhid ailəsinə də qayğı bütün qeyrətli insanların mənəvi borcuna çevrilməlidir.

# Əsgərov Nadir Yolçu oğlu



Əsgərov Nadir Yolçu oğlu 1969-cu ildə Gədəbəy rayonunun Şurakənd kəndində anadan olmuşdur. 1979-1986-cı illərdə həmin kəndin orta məktəbində oxumuşdur. 1987-89-cu illərdə keçmiş Sovet ordusunda xidmət etmişdir. Azərbaycanın ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə könüllü olaraq Vətənin müdafiəsinə qoşulmuşdur. Gədəbəy rayonunda yerləşən “N” hərbi hissəsinin tərkibində “Qoca dağ” sahəsində vuruşmuş və həmin yerdə şəhid olmuşdur. Onun əziz xatirəsi əbədi olaraq qəlbimizdədir. Ailəli olmuşdur. 2 övladı var

# Əsgərov Şəmil Mehbalı oğlu



Əsgərov Şəmil Mehbalı oğlu 1973-cü ildə avqustun 2-də Gədəbəy rayonu Qaraməmmədli kəndində kolxozçu ailəsində anadan olmuşdur. 1990-cı il-də Qaraməmmədli kənd orta məktəbini bitirib. Bakıda SPTU-nun 101 nömrəli məktəbinə daxil olub. 1991-ci ildə həmin məktəbi bitirib. İxtisası sürücü, çilingərdir. 1992-ci ildə aprelin 1-də Gədəbəy rayon hərbi komissarlığı tərəfindən hərbi xidmətə çağırılıb. İvanovkada yerləşən hərbi hissədə xidmətə başlamışdır. Başkəndin alınmasında, Mutudərə və Pereval döyüşlərində iştirak etmişdir. 1994-ci ilin yanvar ayının 7-də Pereval döyüşündə həlak olmuşdur. Yaşadığı kənddə dəfn olunmuşdur. Hal-hazırda oxuduğu məktəb onun adını daşıyır. “AND İÇMİŞƏM, ANA …”1993-cü ilin son günləri idi. Şəmili komandirləri birgünlüyə evə buraxmışdılar. İlahi, sanki, ailəmizdə toy-bayram idi. Hamımız onun nazı ilə oynamağa çalışırdıq. İstəyirdik ailə üzvümüz kimi yox, Vətən torpağının keşiyində dayanan bir əsgər kimi bizdən razı qalsın. Sanki uzun illər idi ki, onunla görüşməmişdik. Yeni il üçün bayram süfrəsi hazırlayan həyat yoldaşım da öz işində idi. Amma bir onda hiss etdim ki, Şəmil tələsik bizimlə sağollaşıb döyüş mövqeyinə yollandı. Söhbət edəndə Lala xala dedi ki: – Ay Mehbalı, onu saxlaya bilmədim hazırlanan süfrə başında əyləşməyə. Dedi ki, ana, komandirin başına and içmişəm, söz vermişəm ki, tezliklə qayıdacağam. Dedim: Ay oğul, komandirə desən ki, anam bayram süfrəsi üçün məni gecikdirdi, vallah heç nə deməz. Onda qayıdıb mənə: – Ay ana, səni çox istəyən oğul indi öz səngərində olmalıdır. Mən də posta öz vaxtında çatmalıyam – dedi. Onu yola salıb, sonra kövrəldim, birtəhər oldum. İndi isə öz-özümə toxtaqlıq verirəm ki, ay rəhmətliyin nəvəsi, sən bəxtəvər anasan, Vətəni düşməndən qoru-yan əsgər anasısan, niyə birtəhər olmalısan. Uğuruna xeyir. Arxasınca bir parç da su atdım…Bunları nağıl edən Mehbalı Əsgərov şəhid atası kimi özünü birtəhər aparmır: Neynək  deyir Vətəni qorumaq kişilərin işidir. Şamilin torpağına qurban olum. Kişi kimi torpaq

qoruyurdu. Son nəfəsinə kimi qorudu da. Elə dəfn günü komandirlərinin onun barəsində yana-yana danışdıqları bizə az toxtaqlıq vermədi. Rəhmətlik briqada komandiri, polkovnik C. Rüstəmov üzünü dəfn iştirakçılarına tutub: – Mən komandir kimi Şamil tək oğullarla fəxr edirəm. O bizdən, xalqımızdan getdi. Cəsur, qorxmaz oğul idi. Xalqımızın belə oğullarla öyünməyə haqqı var. Allah rəhmət eləsin. Qəbri nurla dolsun idi. İnanın ki, mən atasından çox komandir heyfslənirdi bu itki üçün. Nə deyim, oğul yurd yolunda şəhid olubsa bundan böyük müqəddəslik nə olar, deyə bilmərəm  söyləyir Mehbalı kişi… Bəli, Şamil Odlar yurdunun belə igidlərindən biriydi. Qaraməmmədli kəndində dünyaya göz açmışdı. Az yaşadı, çox iş gördü. Arzusu hərbçi olmaq idi, elə əsl hərbçi kimi də hərəkət edirdi. Verdiyi sözə içdiyi hərbi and kimi dəqiq əməl edirdi. İndi isə Mehbalı əminin və Lala xalanın bir təsəllisi var: vaxtilə Şamilin oxuduğu, hazırda onun adını daşıyan Qaraməmmədli kənd orta məktəbində təhsil alan gənclərimiz həmişə igidlikdə Şamil kimi ad-san qazansınlar. Elin-obanın layiqli övladları olsunlar…

# Əsgərov Zahid Hümbət oğlu



Əsgərov Zahid Hümbət oğlu 1973-cü ildə Gədəbəy rayonunun Qozqaralı kəndində doğulmuş və həmin kənddə boya-başa çatmışdır. 1992-ci il sentyabr ayında hərbi xidmətə getmişdir. 1993-cü ilin iyun ayında Gədəbəy rayonu ərazisində erməni təcavüzkarlarına qarşı döyüşmüşdür. Zahid İvanovka ərazisində yerləşən hərbi bölgədə xidmət etmişdir. Örükdaş, Sarıqaya uğrunda gedən döyüşlərdə qəhrəmancasına həlak olmuşdur.

## ƏSGƏROVA BƏSTİ İMANVERDİ QIZI

(I sıra, sağda, 1947-1993, Mormor kəndi) 1947-ci ildə Ağstafa rayonunun Köçəsgər kəndində anadan olmuşdur. 1954-cü ildə Köçəsgər kənd orta məktəbinin 1-ci sinfinə daxil olub, 1965-ci ildə həmin məktəbin 11-ci sinfini bitirmişdir. 1970-ci ilin 1 sentyabrından Gədəbəy rayon Zamanlı kənd orta məktəbinə laborant vəzifəsinə girib. 1993-cü ilin aprel ayına qədər işləyib. 18

aprel 1993-cü ildə Gədəbəy rayonunun Zamanlı kəndində ailəlikcə – baldızı və onun 3 övladı ilə birlikdə şəhid olub.

QAFAROVA OFELYA MİRZAMAN QIZI

1951-ci ildə Zamanlı kəndində anadan olub.

QAFAROVA AYTƏKİN SAHİB QIZI

1979-cu ildə anadan olub. Zamanlı kənd orta məktəbinin 6-cı sinfində oxuyurdu.
QAFAROV SAMİR SAHİB OĞLU 1978-ci ildə anadan olub. Zamanh kənd orta məktəbinin 9-cu sinfində oxuyurdu.

**QAFAROV YAŞAR SAHİB OĞLU**

1981-ci ildə anadan olub. 5-ci sinifdə oxuyurdu.

# Hacıyev Fərrux Nəsrəddin oğlu



Hacıyev Fərrux Nəsrəddin oğlu 1972-ci ildə Gədəbəy rayonu Hacılar kənd sovetliyinin Əyridərə kəndində anadan olmuşdur. 1979-cu ildə Hacılar kənd orta məktəbinin birinci sinfinə getmişdir. Oranı 1990-cu ildə bitirmişdir. 1992-ci il aprel ayının 2-dən 861 saylı hərbi hissədə hərbi xidmətə başlamışdır. 1992-ci il iyul ayının 12-də Şınıx zonası uğrunda gedən döyüşdə döş qəfəsi nahiyəsindən aldığı ağır güllə yarası nəticəsində şəhid olmuşdur.

# Haqverdiyev Elman Əli oğlu



Haqverdiyev Elman Əli oğlu 1972-ci il noyabrın 5-də Gədəbəy rayonunun Arıqdam kəndində anadan olub. 1987-ci ildə orta məktəbi bitirib. Sonra 148 nömrəli peşə məktəbinə daxil olub. Oranı 1990-cı il də bitirdikdən sonra hərbi xidmətə çağırılıb. Rusiyada altı ay xidmət etdikdən sonra Vətənə qayıdıb. İlk döyüş yolunu Gədəbəy rayonunun İvanovka kəndindən başlayıb. N saylı hərbi hissədə qulluq edib. İsgəndər qalasının və bir neçə postların alınmasında iştirak edib. Murovdağ uğrunda gedən döyüşlərdə 1994-ci il fevralın 17-də itgin düşüb.

# Heydərov Şamil Sadiq oğlu



Heydərov Samir Sadiq oğlu 1977-ci ilin 18 aprelində Gədəbəy rayonunun Arıqıran kəndində anadan olub. 1984-cü ildə birinci sinfə gedib. 1994-cü ildə orta məktəbi bitirib. 1995-ci ilin 25 iyununda Azərbaycan ordusunda hərbi xidmətə çağırılıb. Piriküşküldə təlim keçib. 1995-ci ilin 10 oktyabrında Kəlbəcər bölgəsində Murovdağ, Güzgüdağ, 1996-cı ilin 1 mayından isə Daşkəsənin Alaxancal kəndində 172 saylı briqadanın 3-cü batalyonunda qulluq edib. Ara-sıra erməni quldurları həmin yerə atəş açırmış. Bunu görən Samir 3 km irəli sürünüb. Onun bu təşəbbüsü sayəsində həmin məsafə ermənilərdən geri alınıb. Heydərov Samir Sadiq oğlu 21 mart 1997-ci ildə xidməti vəzifəsini yerinə yetirərkən həlak olmuşdur.

# Həsənov Eldar İdris oğlu



Həsənov Eldar İdris oğlu 18 iyul 1966-ci ildə Leşkər kəndində anadan olub. 1974-cü ildə Leşkər kənd natamam orta məktəbinə, 1981-

ci ildə kiçik Qaramurad kənd orta məktəbinə getmiş və 1984-cü ildə orta təhsilini başa vurmuşdur. 1985-ci ildə sürücülük kursunu bitirib. 1985-87 illərdə Sovet ordusunda hərbi xidmətdə olub. 1988-ci ildə Gəncə şəhər 2705 saylı avtomobil dəstəsində sürücü işləməyə başlamışdır. 1992-ci ildə evlənib. Torpaqlarımızda gedən qanlı müharibədə o da öz sözünü demək istəyirdi. Buna görə də ailə həyatı qurduqdan bir ay sonra, qəlbi daim Vətən eşqi ilə döyünən bu gənc silaha sarılaraq Vətənin müdafiəsinə qalxdı. Eldar Ağdərə rayonunun bir sıra döyüş nöqtələrində yağılarla üzbəüz gəldi, həmişə də qeyrətlə döyüşdü. Ağdərə istiqamətində igid oğullarımız düşmənə sarsıdıcı zərbələr endirirdilər. Düşmənin müqaviməti qırılır və geri oturdulurdu. Rayonun bir çox kəndləri düşməndən azad olmuşdu. Çıldıran kəndi uğrunda ağır döyüşlər başlanmışdı. Həmin döyüşlərdə Eldar da döyüşürdü. Sürücülük vəzifəsini ataraq silaha sarılan Eldar misilsiz şücaətlər göstərirdi. 1992-ci il dekabr ayının 15-i idi... Çıldıran kəndi uğrunda ağır döyüşlər gedirdi. Həmin döyüşlərdə düşmən gülləsi Eldara tuş gəldi. O, qəhrəmancasına şəhid oldu. Fərəhli haldır ki, əlaqədar təşkilailar Eldarın oxuduğu Leşkər kənd orta məktəbinə onun adını veriblər. Həmin məktəbdə təhsil alan gənclər də Eldarın adına layiq, qeyrətli, namuslu gənclər kimi yetişəcəklər və onlara bir həqiqət aydındır! Yağı düşmən Ana yurdumuzun gözəl, guşələrindən olan Dağlıq Qarabağı İşğal etmişlər. Neçə-neçə günahsız oğul və qızlarımız, vətən uğrunda şəhid olmuşlar. Tez bir zamanda yağı düşmən Vətənimizdən qovulacaq. Nankor Ermənilərə layiqli, zərbələr endirərək, neçə-neçə Eldar kimi qeyrətli şəhidlərimizin ruhunu şad edəcəklər. Eldarın adını daşıyan E.Həsənov adına Leşkər kənd orta məktəbində hər ilin 15 dekabırında müəllim və şagird kollektivi, qohumlar, dostlar və kənd sakinləri birlikdə Eldarın əziz xatirəsini yad edir, bütün şəhidlərimizə rəhmət diləyir, düşmənə nifrətlərini bildirirlər.

# Həsənov Elsever Yaqub oğlu



Həsənov Elsevər Yaqub oğlu 1973-cü il dekabr ayının 2-də Gədəbəy şəhərində anadan olmuşdur. 1980-ci ildə Gədəbəy şəhərində keçmiş N.K.Krupskaya adına məktəbin birinci sinfinə getmişdir. Oxuduğu müddətdə məktəbdə keçirilən tədbirlərin gənc iştirakçısına çevrilmişdir. Yaxşı oxu-yan şagirdlərdən biri idi. 1990-cı ildə orta məktəbi bitirmişdir. 1991-ci ildə Bakı şəhərinə texnikuma sənəd vermiş, qəbul olmamışdı. Geri qayıdıb 1992-ci ildə könüllü olaraq çağırış vərəqəsini götürüb əskəri xidmətə getmişdir. 1992-ci ilin avqust ayının 22-də Şınığın Mutudərə kəndində şəhid olmuşdur.

# Həsənov Əli Hidat oğlu



Həsənov Əli Hidat oğlu 1963-cü ildə Arıqıran kəndində anadan olub. 1980-cı ildə Arıqıran kənd orta məktəbini bitirib. 1981-ci ildə Gədəbəy rayon hərbi komissarlığı tərəfindən keçmiş Sovet ittifaqının ordu sıralarına hərbi xidmətə göndərilmiş, 1983-cü ildə hərbi xidmətini layiqincə yerinə yetirib doğma kəndə, doğulduğu Arıqıran kəndinə qayıtmışdır. 1984-cü ildən əmək fəaliyyətinə Gəncə şəhər alüminium zavodundan başlamışdır. Az bir zamanda kollektivin dərin hörmətini qazanmış, qabaqcıl işçi kimi tanınmışdır. Talelərinə, ömür kitablrına şəhidlik qisməti yazılan Gədəbəy rayonunun mərd, cəsur oğulları kimi siravi Həsənov ƏH Hidat oğlu da biganə qalmayıb. 1994-cü ilin mart ayında könüllü olaraq Gəncə şəhər Kəpəz rayon hərbi komissarlığına gedib, oradan döyüş bölgəsində, Tər-tər şəhərində yerləşən 703 saylı hərbi həssənin 2-ci motoatıcı taborunda xidmət etməyə başlayır. Lakin çox keçmir ki, 1994-cü ilin noyabr ayının 9-da xidməti vəzifəsini yerinə yetirərkən şəhid olur. Oğul dağına dözməyən atası Həsənov Hidat az sonra vəfat etmişdir.

Əli Həsənov Gəncə şəhərində yaşayırdı. Ailəli idi. İki övladı var. “İgid ölər adı qalar”, “Polad sınar, amma əyilməz” deyib atalar.

# Həsənov Fazil İsa oğlu



Həsənov Fazil İsa oğlu 1974-cü ildə anadan olub. 1981-ci ildə İsalı kənd orta məktəbinin 1-ci sinifinə getmiş, 1991-ci ildə həmin məktəbin 11-ci sinifini bitirmişdir. 1992-ci ildə hərbi xidmətə çağrılıb. Vətənə övladlıq borcunu ləyaqətlə verən Fazil Qarabağ uğrunda gedən döyüşlərdə böyük şücaət və qəhrəmanlıqlar göstərib. 1993-cü ildə Ağdərədə həlak olub. Subay idi.

# Həsənov Qafur Bəxtiyar oğlu



Həsənov Qafur Bəxtiyar oğlu 6 fevral 1975-ci ildə Gədəbəy rayonu Hacılar sovetliyinin Qaravəllər kəndində anadan olmuşdur. 1982-ci ildə Qaravəllər kənd orta məktəbinin birinci sinfnə daxil olub, həmin məktəbin 11-ci sinfini bitirmişdir. On səkkiz yaşı tamam olmadığına görə hərbi xidmətə çağırılmamışdır. Qaravəllər kəndinin Ermənistanla sərhəd olan Ağdaşda Yolin adlanan yerdə 30 may 1992-ci ildə erməni quldurları onu ağır yaralamış, həmin yaradan 30 aprel 1993-cü ildə vəfat etmişdir.

# Həsənov Mansur İdris oğlu



Həsənov Mansur İdris oğlu 1977-ci il yanvar aymın 14-də Gədəbəy rayonunun Əyrivənk kəndində doğulmuşdur. Həsənov orta təhsilli idi. O 1984-cü ildə Əyrivənk kənd orta məktəbin 1-ci sinifinə daxil olub. 1994-cü ildə Arıqıran kənd orta məktəbini bitirib. 24 fevral 1996-cı il-də Ağdamda şəhid olmuşdur. Sakit təbiətli, təlim-tərbiyyəli bir şagird kimi öz şagird yoldaşlarınm və müəllimlərinin qəlbində əbədi yaşayacaq. Subay idi. Arzusu həmişə Vətən torpağmı azad, bütöv görmək idi. İnanırıq ki, torpaqlarımız tezliklə azad olacaq. Şəhid övladlarımızm ruhu şad olacaq. Allah sənə rəhmət eləsin Mansur! Vətən səni, eləcə də bütün şəhidlərimizi unutmayacaq.

# Həsənov Suliddin Abbas oğlu



Həsənov Suliddin Abbas oğlu 1972-ci il yanvar ayının 1-də Gədəbəy rayonun Qoşabulaq kəndində kolxozçu ailəsində anadan olub. 1980-ci ildə Gədəbəy rayonunun 2 saylı Qoşabulaq kənd orta məktəbinin 1-ci sinifinə gedib. 1990-ci ildə həmin məktəbin 10-cu sinifini bitirib. 1990-91-ci illərdə Rusiyaya hərbi xidmətə gedib. Qayıtdıqdan sonra 1992-ci ildə könüllü olaraq Qarabağ hərbi hissəsinə döyüş bölgəsinə gəlib. 1993-cü il 17 oktyabrda Ağdamın Yusifcanlı kəndində şəhid olub.

BİR İGİD UYUYUR

Daha sözlər də bir-birinə bənzəyir – torpaq uğrunda şəhid olan oğullarımızın boy-buxunu, baxışları kimi... Oktyabr ayının 17-də şəhidlərin sırasına daha bir igid oğlumuz Suliddin Abbas oğlu Həsənov da qoşuldu. O, 1972-ci ildə, Qoşabulaq kəndində kolxozçu ailəsində anadan olmuşdu. Qoşabulaq kənd 2 nömrəli orta məktəbi bitirdikdən sonra ali təhsil almaq üçün Bakıya yollanan Suliddin məqsədinə nail ola bilmir. Açıq-aşkar qanunsuzluğun, obyektivsizliyin dadını duyduqdan sonra doğma kəndlərinə istehsalata qayıdır. Qoşabulaq 2 nömrəli orta məktəbin direktoru Rəcəb Hə-sənovun dediklərindən: – Suliddin gözümüzün önündə böyüyüb. Demirəm ki, qeyri-adi uşaq idi. Ancaq onun özünəməxsus xüsusiyyətləri vardı. Əvvəla çox istiqanlıydı. Yoldaşlarına tez bir vaxtda isinişə bilirdi və dostluqda möhkəm idi. Həddindən artıq mülayim, eyni dərəcədə qorxmaz idi. Hər şeyi ürəyinə salardı. Bir

müəllim kimi onu deyə bilərəm ki, oxuduğu on il ərzində məktəbdə elə hal olmayıb ki, kimsə Suliddindən narazı qalsın, istər məktəb yoldaşları, istərsə müəllim kollektivi. Biz Suliddinin simasında xalqımızın qeyrətli bir oğlunu itirdik. Bu itki təkcə onun qohumlarının yox, bütün Qoşabulaq camaatının qəlbini göynətdi. Hərbi xidmətini uzaq Sibirin şaxta-boranında başa vuran S.Həsənov torpaqlarımızın erməni caynaqlarında tapdalanmasına, ev-eşiyin dağıdılıb viran olmasına, qız-gəlinlərin namusunun tapdalanmasına dözə bilmirdi. Onun öz rayonu da erməni quldurları ilə həmsərhəd idi. Tez-tez qonşu kəndləri top-tüfəng, arteleriya atəşinə məruz qalırdı, ancaq Suliddin könüllü olaraq hərbi komissarlığa gəldi və Qarabağda vuruşmaq arzusunda olduğunu bildirdi. Həmin günü kiçik bacısı Güldanə belə xatırlayır: – Avqustun 18-də axşamüstü Suliddin evə gəldi. Qanı bərk qara idi. Soruşdum ki, nə olub? Heç nə demədi. Təzə paltarlarını geyinib evdən çıxdı. Rayon mərkəzində işi olduğunu bildirdi. Sən demə, komissarlığa gedirmiş... Suliddin Ağdam Yusifcanlı kəndindəki hərbi hissədə qulluq edirdi. Evə tez-tez xəbər göndərirdi. Oktyabrın 17-də Suliddin üç yoldaşı ilə növbədə dayanmışdı. Erməni quldurları qəfildən hücuma keçdilər. Qeyri-bərabər döyüşdə əsgərlərimizin dördü də yaralandı... Bir neçə saatdan sonra Suliddin əbədi olaraq gözlərini yumdu. İndi Qoşabulaqda bir igid uyuyur. Arzuları yarımçıq qal-mış igid. Ancaq bu gün olmasa da, sabah o arzuları Suliddinin özü kimi torpaq qayğısı, Vətən təəssübü çəkən əskər yoldaşları həyata keçirəcəklər. Qəm etmə, Abbas əmi, Zinyət xala! Fəxr edin ki, Suliddin kimi oğul böyüdübsünüz. Allah rəhmət eləsin. Qəbri nurla dolsun.

# Həsənov Tofiq Əli oğlu



Həsənov Tofiq Əli oğlu 1955-ci il may ayının 14-də Arıqıran kəndində anadan olub. Orta təhsil almışdı. Evli idi. 1992-ci il avqustun 8-dən 1994-cü il fevralın 4-ə qədər 171 saylı briqadada xidmət etmişdir. O, əsgəri xidmətini başladığı ilk gündən komandirinin bütün əmrlərinə sözsüz əməl etmiş, özünü yüksək döyüş hazırlığma malik bir hərbçi kimi göstərmişdir. 8 avqust 1992-ci ildə Başkənd əməliyyatında iştirak edib ermənilərin bir sıra nəqliyyat vasitələrinin ələ keçirilməsində xüsusi fəallıq göstərmişdir.

1993-cü il 18 apreldə Keçəldağ əməliyyatında iştirak edən Tofiq Həsənov düşmənin canlı qüvvəsinin məhv edilməsində xüsusi mərdlik göstərmişdir.
29 yanvar 1994-cü ildə Gədəbəy rayonunun ermənilərdən təmizləmək üçün yaradılmış döyüş mövqeyinə ezam edilmişdi. Döyüşdə bütün qüvvəsini əsirgəməyən Tofiq 5 nəfər düşməni təkbaşına məhv etmiş, axırda özü də aldığı ağır güllə yarasından həlak olmuşdur. Həsənov Tofiq Əli oğlu Gədəbəy rayonunun şəhidlər xiyabanında dəfn edilmişdir.

# Həsənov Eldəniz Novruz oğlu



Həsənov Eldəniz Novruz oğlu 1973-cü il iyun ayında Zəngilan rayonunda dünyaya göz açmışdır. 1987-ci ildə Zəngilan rayonundan ailəsi ilə birlikdə Gədəbəy rayonuna öz dədə-baba Kəlaman kəndinə gəlib məskunlaşmışdılar. E.Həsənov Hacılar kənd orta məktəbini bitirmişdi. 1990-cı ildə Sovet ordusu sıralarına həqiqi hərbi xidmətə göndərilmişdir. Mənfur ermənilərin torpaqlarımızda qarşı amansız döyüşləri Eldənizi də rahat buraxmadı. 1991-ci ildə doğma Gədəbəy torpağına qayıtdı. Həmin il Gədəbəyin İvanovka və Saratovka kəndləri yaxınılığındakı qaynar nöqtələrdə-Hörükdaş və Sarıqaya döyüşlərində Erməni təcavüzkarlarına qarşı döyüşməyə başladı. Döyüş yoldaşları onu cəsur və qorxubilməz çavuş kimi xatırlayırlar. E.Həsənov 1994-cü ilin fevral ayının əvvələrində bir neçə silahdaşları ilə birlikdə Murovdağ əməliyyatına köməyə getmişlər. E.Həsənov həmin döyüşlərdə fərqlənmişdir. 1994-cü ilin fevral ayının axırlarında Murov dağında qəhrəmancasına həlak olmuşdur. Vətən yolunda canını fəda edən Vətən övladları əslində ölmür, əksinə-ölümü ilə ölümsüzlük qazanır, şəhidlik adına yüksəlir, qədirbilən xalqımızın qəlbində əbədi yaşayırlar.

# Hüseynov Aqil Baxçəli oğlu



Huseynov Aqil Baxçəli oğlu 1975-ci ildə anadan olub. 1993-cu ildə hərbi xidmətə getmişdi. Sümüklü postu uğrunda gedən döyüşdə 1994-cü ildə avqust ayının 6-da həlak olmuşdur.

# Hüseynov Elfaq Oruc oğlu



Hüseynov Elfaq Oruc oğlu 1969-cu ildə iyulun 15-də Gə-dəbəy rayonunun Qaraməmmədli kəndində anadan olmuş-dur. Elfaq orta məktəbdə oxuyarkən öz yaşıdlarından sakit təbiəti, elmə həvəsi ilə fərqlənirdi. Valideynləri ona böyük ümüd bəsləyir, dərsləri ilə məşğul olması üçün hər cür şərait yaradırdılar. Orta məktəbi qurtardıqdan sonra, Sovet ordu sıralarında hərbi xidmətini yerinə yetirib təhsilini Azərbaycan Texniki Universitetində davam etdirirdi. Texniki Universitetin IV kurs tələbəsi idi. O, ermənilərin vəh-şiliklərinə dözməyib könüllü batalyona yazıldı. Gənc leytenantın döyüş yolu Başkəndin alınmasından başlandı. Bu döyüşdə Elfaq qəhrəmanlıq və fədakarlıq nümunəsi göstərərək düşmənin xeyli piyada qüvvəsini məhv etmiş, döyüş yoldaşlarnı mühasirədən çıxartmışdı. Yoldaşları

arasında cəsurluğu və hərbi intizamı ilə seçilən bu Vətən oğlu neçə-neçə qanlı döyüşdə düşmənə ağır itgilər vermişdi. Başkənd döyüşündə torpaq da, daş da alışıb yanırdı. Başkənd alov içərisindəydi. Ermənilər sol cinahdan kəndin mərkəzinə daxil olan əsgərlərimizi mühasirəyə almağa çalışırdılar. Elfaq bu barədə polkovnik Cahangir Rüstəmova məlumat verdi. Polkovnikin gur səsi eşidildi:

Dəstəni götür, təcili onlara köməyə get.  Oldu, yoldaş polkovnik, – deyə Elfaq bildirdi. Başkəndin evləri bir-birinə yaxın tikildiyindən mövqeyi tez-tez dəyişmək mümkün idi. Elfaq təxmini hesabladı ki, minaya düşməsələr 10-12 dəqiqədən sonra mühasirəyə düşmüş dəstənin döyüşçülərini xilas edə bilərlər. Erməni ordusunun döyüşçüləri özlərini itirib qaçmağa üz qoydular. Dö-yüşçülərimiz mühasirədən çıxdılar. Bu döyüşdə Elfaqın dəstəsi düşmənin xeyli qüvəsini məhv etdi. O, Gədəbəyin dağlarını seyr etməkdən ləzzət alırdı. Səhərlər tezdən oyanar, köksü qırmızı lalələrə bələnən dağlara həsrət-həsrət boylanardı. Döyüşdən qabaq “Öldüyüm günü” şeirni yazmışdı. O, bu şeirini səngərdə asta-asta oxuyardı.

## Hüseynov Elmar Məhərrəm oğlu



Hüseynov Elmar Məhərrəm oğlu 15 may 1974-cü ildə Gədəbəy rayonunun Dəyəqarabulaq kəndində anadan olmuş-dur. 1981-ci ildə Dəyəqarabulaq kənd orta məktəbinin birinci sinfinə daxil olub, 1991-ci ildə həmin məktəbin onuncu sinfini bitirmişdir. 1992-ci ildə Gədəbəy rayon hərbi komissarlığı tərəfindən hərbi xidmətə göndərilmişdir. Beyləqan rayonu 181 nömrəli hərbi hissədə xidmət edərkən 4 aprel 1996-cı ildə minaya düşüb şəhid olmuşdur.

# Hüseynov Əli Mikayıl oğlu



Hüseynov Əli Mikayıl oğlu 1974-cü ildə noyabırın 4-də kolxozçu ailəsində anadan olmuşdur. 1992-ci il dekabırın 1-də hərbi xidmətə çağırılmışdır. 1994-cü il yanvarın 3-də Ağdərə uğrunda gedən döyüşlərdə şəhid olub. Atası Hüseynov Mikayıl Rəsul oğlu və anası Atlas Məhər qızının Əlidən savayı 7 oğlu (Kərim, Rəhim, İsa, Musa, Mürsəl, Tofiq, İbrahim) və 2 qızı (Zöhrə, Zemfira) olsa da yenə Əlinin dərdini heç vaxt unuda bilmirlər. Bu təsəllidir ki, oxuduğu Əyrəvəng kənd natamam orta məktəbi Əli Hüseynovun adını daşıyır.

# Hüseynov İbrahim Rəsul oğlu



Hüseynov İbrahim Rəsul oğlu 15 oktyabr 1953-cü ildə Gədəbəy rayonunun İsalı kəndində anadan olmuşdur. 1972-ci ildə İsalı kənd orta məktəbini bitirmiş, 1973-75-ci illərdə hərbi xidmətdə olmuşdur.
Hərbi xidmətdən qayıtdıqdan sonra İsalı rabitə govşağında telefonçu, təmirçi vəzifəsində işləmişdir. 1977-ci ildə ailə həyatı qurmuşdur. Beş övladı olmuşdur. 1977-ci ildən 90-cı ilə qədər İsalı rabitə qovşağında işləmişdir. 1990-cı il yanvarın 30-da

Gədəbəy şəhərinə gedib, geri qayıdanda erməni quldurları tərəfindən qətlə yetirilmişdir.

# Hüseynov Mahir Səfxan oğlu



Hüseynov Mahir Səfxan oğlu 1973-cü ildə anadan olub. 1980-cı ildə Sarıhəsənli kənd orta məktəbinin 1-ci sinfinə daxil olmuşdur. 1990-ci ildə həmin məktəbi bitirmişdir və hərbi xidmətə getmişdir. Ağdam uğrunda döyüşlərdə itgin düşmüşdür.

# Hüseynov Kamandar Kamal oğlu



Hüseynov Kamandar Kamal oğlu 1960-cı ildə Gədəbəy rayonunun Əyridərə kəndində anadan olmuşdur. 1978-ci ildə Hacılar kənd orta məktəbini bitirmişdir. Həmin ilin payızında Sovet ordusu sıralarına çağırılmışdır. Hərbi xidməti başa vurduqdan sonra həmin kəndə qayıtmışdır. 1982-ci ildə Gəncədə DPİ-nun Biologiya fakültəsinə daxil olmuşdu. İnstitutu 1987-ci ildə bitirmişdir. Həmin ildən Hacılar kənd orta məktəbində müəllim işləmişdir. 2001-ci il tarixdə erməni quldurları tərəfindən qətlə yetirilmişdir. Hacılar kənd orta məktəbinin kollektivi Hüseynov Kamandar Kamal oğlunun xatirəsini hər il yad edirlər. Hüseynov Kamandar Kamal oğlu ailəli idi. 3 övladı var. Oğlu Hüseynov Taleh qeyd etdi ki, atası işlədiyi kollektiv üzvləri ona çox mehribanlıqla yanaşırlar. Həmçinin məktəbin kollektivi, rayon rəhbərliyi də onlara öz qayğılarını göstərirlər.

## Hüseynov Mehman Qənbər oğlu



Hüseynov Mehman Qəmbər oğlu 1968-ci ildə Gədəbəy rayonunun Novosaratovka kəndində anadan olub. 1976-ci il-də Novosaratovka kənd orta məktəbinin birinci sinifinə daxil olub. 1986-cı ildə Novosaratovka kənd orta məktəbini bitirib. Bakı çörəkbişirmə kombinatında işləyib. Subay idi. 18 mart 1993-cü ildə Kəlbəcər döyüş bölgəsində gedən döyüşdə itgin düşmüşdür.

## Hüseynov Niyazi Şəmil oğlu



Hüseynov Niyazi Şəmil oğlu 1973-cü il yanvarın 19-da Gədəbəy rayonunun Slavyanka kəndində anadan olub. Orta məktəbin səkkizinci sinifinə qədər bu kənddə oxuyub. 1987-ci ildə Gədəbəy rayon texniki peşə məktəbində təhsilini davam etdirib. Oranı bitirdikdən sonra 1991-ci ildə Qazağıstan respublikasına hərbi xidmətə göndərilib. Həmin ildə Azərbaycana qarşı ermənilərin elan edilməmiş müharibəyə başlamasına görə Vətənə dönmüşdür. 1992-ci ildə Azərbaycan Ordusunun əsgəri kimi Vətəni qorumaq üçün qanlı döyüşlərdə iştrak etmişdir. Hansı bölgədə ağır vəziyyət yaranıbsa Niyazi Hüseynovu o bölgəyə köməyə göndəriblər. Son döyüşü Gədəbəyin Şınıx perevalı deyilən bölgədə olub. Orada toyuna üç gün qalmış 1992-ci il noyabrın 17-də şəhid olub.



## Hüseynov Nofəl Fərhad oğlu

Hüseynov Nofəl Fərhad oğlu 1974-cü il dekabrın 1-də İnəkboğan sovetliyinin

Köhnəqışlaq kəndində anadan olmuşdur. Orta təhsillidir. Nofəl üç ay Astara batalyonunda təlimdə olub. Əvvəlcə Ağcabədi rayonu ərazisinə göndərilib. Ağdam istiqamətində Nərgiztəpə yüksəkliyi uğrunda vuruşlarda iştirak edib. Düşmənə endirilən sarsıdıcı zərbələrdə onun əməyi vardır. Beyləqan döyüşlərinin iştirakçısıydı. Qızılqaya, Kaftar dağı uğrunda döyüşüb. 1994-cu il yanvarın 27-də Şişqaya yüksəkliyi uğrunda cəsarətlə döyüşüb və şəhid olub.

## NOFƏL QORXMAZ OĞUL İDİ

1974-cü il dekabr ayının 1-də doğma yurdun Köhnəqışlaq kəndində gənc bir ailənin ilk sevinci, güvənc yeri kimi dünyaya göz açmışdı Nofəl. İndi qədəm qoyduğumuz bahar ətirli, yaz qoxulu bir körpə pöhrələnmişdi Fərhad müəlli-min, Zenfira bacının təzəcə istiləşən od-ocağında. Xoşbəxt günlərini yaşayan gənc ailədə əzizlənə-əzizlənə, oxşana-oxşana boy atırdı o. Böyüdü Nofəl, məktəb yaşına çatdı. Doğma kənddə səkkizinci sinfi, İnəkboğan kəndində isə 1992-ci ildə orta məktəbi müvəffəqiyyətlə başa vurdu... Qarşıda ana borcu, Vətən keşiyi vardı. Bunu dərindən düşünür, sanki özünü gələcək döyüşlərə hazırlayırdı bu igid oğul, mübariz əsgər. Bəzən daxilində baş qaldıran saysız-hesabsız suallara öz-özlüyündə cavab axtara-axtara bu gidi dünyanın haqsız işlərinə lənət yağdırardı. Nədir bu xalqın günahı? Niyə haqqa-ədalətə düzgün qiymət verən yoxdur? Nə isə... Bu düşüncələr ümmanında Nofəl yüzlərlə həmyaşıdı, qeyrətli cavanlar kimi rayon hərbi komissarlığının çağırışnı gözləyirdi. Gəldi o gün, çatdı o vaxt... Valideynlər öz ciyərparalarnı Vətən keşiyinə yola saldılar, uğurlu yol arzuladılar ona. Sağ-salamat qayıtmasını di-lədilər ulu tanrıdan... Nofəl Hüseynov üç ay Astara batalyonunda hərbi təlim keçdi. Silahların, texnikanın “dilini” öyrəndi, mənimsədi. Komandirlərinin, əsgər dostlarının dərin hörmətini qazandı az vaxt içərisində... Əvvəlcə Ağcəbədi rayonu ərazisinə göndərildi. Burada Ağdam istiqamətində Nərgiztəpə yüksəkliyi uğrunda vuruşlarda iştirak etdi. Düşmənə sarsıdıcı zərbələr endirildi.. 1993-cü ilin oktyabr günləri... Yəqin ki, bu dövrkü hadisələri Odlar yurdunun hər bir övladı unutmayıb, yaxşı xatırlayır. Onda quldurlar qədim Beyləqan şəhərinin lap yaxmhğma qədər gəlib çıxa bilmişdilər. Mərkəzi obyektlərdən bir neçəsini, hətta zirehli texnikadan atılan atəşlə dağıtmışdılar. Nofəl də həmin o ağır anlarda Beyləqan döyüşlərinin iştirakçısıydı. Dostları ilə Qızılqaya, Kaftar dağı uğrunda gedən əməliyyatlarda ön cərgədə döyüşürdü. Burada azğın vəhşilərə layiqli cavab verildi. Onların burunları ovuldu. Nofəlin döyüşdüyü dəstə “Gecə quşu” adı ilə məşhurlaşmışdı. Düşmən tərəf bu dəstənin əlindən dad çəkirdi... 1994-cü il yanvarın 27-si. Nofəlin döyüşdüyü dəstənin (onlar 22 nəfər olublar) üzvləri komandanlıq tərəfindən tapşırıq almışdılar ki, Şişqaya yüksəkliyini götürmək üçün öndə mövqe tutmaq lazımdır, sonra arxadan kömək gələcəkdir.

Cəsur döyüşçülərimiz gecə ikən öndə mövqe tutub, yerlərini möhkəmlədirlər. Səhər tezdən dumanlı havada ar-xadan gözlənilən kömək gəlib çıxmır. Əsgərlərin səbri tükənir. Saat 10 radələrində isə ətrafdan duman yavaş-yavaş çəkilməyə başlayır. Bunu görən əsgərlərimiz döyüşə atılırlar. Qeyri-bərabər döyüşlərdə erməni vəhşiləri soydaşlarımızın 8 nəfərini qətlə yetirirlər. Nofəlin həmkəndlisi Xəzail Əmir oğlu Əliyev də həmin qanlı əməliyyatda itkin düşür. İndiyə qədər də onun barəsində heç bir dəqiq məlumat yoxdur. Sonrakı döyüşlərdə kəşfiyyatçılarımız tərəfindən Nofəlin və ondan qeyri yeddi nəfər cəsur döyüşçümüzün meyidlərini çıxara bilirlər. Xəzaillə itkin düşən on dörd nəfərin taleyi isə hələ də müəmmalı qalır... Fərhad müəllimin dediklərindən: – Nofəlin döyüşdüyü hərbi hissələrdə olmuşam. Koman-dirləri, əsgər dostları onun barəsində həmişə xoş sözlər söyləyir, qorxmazlığından, cəsurluğundan danışırdılar. Hətta bir dəfə komandiri onu evə məzuniyyətə buraxmaq üçün icazə də verdi. Lakin Nofəl razılaşmadı. Dedi ki, ata, döyüşlərə təzə-təzə girişmişik. Qoy bu quldurları torpaqlarımızdan təmizləyək. Allah qoysa onda özüm icazə alıb ev-mizə gələrəm. Mən də onunla sağollaşıb geriyə qayıtdım. Lakin bir müddətdən sonra, vallah qmamaym, ata qəlbidir, dözə bilmədim. Yenidən Nofəlin vəziyyəti ilə maraqlanmaq üçün onun döyüşdüyü hərbi hissəyə getdim. Kaş ki, getməyəydim. Orada bu ağır xəbəri eşitdim ki, erməni vəhşiləri uşaqları mühasirəyə salıb məhv ediblər... Fərhad müəllimi dinləmək istəyən hər kəs gərək ilk növbədə özünü əla ala bilsin. Vallah onun danışdığı hadisələr adamı odsuz-ocaqsız yandırıb yaxır. Bir xahişi bu oldu ki, mənim heç bir təşkilatdan, heç kəsdən umu-küsüm yoxdur. Bircə Nofəlin xidməti qiymətləndirilsin, adı əbədiləşdirilsin. Əlbəttə, onun valideyn kimi, şəhid döyüşçü atası kimi, buna mənəvi haqqı vardır. İnanırıq ki, əlaqədar təşkilatlar Fərhad müəllimin bu arzusunu nəzərə alacaq, cəsur döyüşçü Nofəl Hüseynovun adını əbədiləşdirəcəklər...

# Hüseynov Rövşən Nuru oğlu



Hüseynov Rövşən Nuru oğlu 1975-ci ildə Gədəbəy rayonunun Ağamalı kəndində anadan olmuşdur. 1982-ci ildə Ağamalı kənd orta məktəbinin birinci sinfinə daxil olub, 1992-ci ildə həmin məktəbin 10-cu sinfini bi-tirmişdir. 1993-cü ilin may ayında Gədəbəy rayon hərbi komissarlığından hərbi xidmətə çağırılmış və

birbaşa Ağdam bölgəsinə göndərilmişdir. 26 dekabr 1993-cü ildə Ağdam rayonunun Mərzili kəndi uğrunda gedən döyüşlərdə itgin düşmüşdür.

# Hüseynov Səhhət Ədil oğlu



Hüseynov Səhhət Ədil oğlu 9 avqust 1973-cü ildə Xarxar kəndində anadan olub. 1980-ci ildə Xarxar kənd orta məktəbinin birinci sinifinə getmişdir. 1990-cı ildə həmin məktəbin onuncu sinifini bitirmişdir.
1992-ci il mayın 5-də Gədəbəy rayon hərbi komissarlığı tərəfindən hərbi xidmətə çağırılmışdır. Həmin tarixdən hərbi xidmətini Gədəbəy rayon Şınıx bölgəsində başlamış, 17 noyabr 1992-ci ildə hərbi borcunu yerinə yetirdiyi zaman şəhid olmuşdur.

# Hüseynov Şahin İsmixan oğlu



Hüseynov Şahin İsmixan oğlu 6 fevral 1971-ci ildə Gə-dəbəy rayonunun Novosaratovka kəndində anadan olub. 1978-ci ildə Novosaratovka kəndində orta məktəbin birinci sinifinə getmiş, 1988-ci ildə həmin məktəbi bitirmişdir. 1993-cü ildə hərbi xidmətə yollanmışdır. 21 dekabr 1994-cü il tarixdə 171 saylı hərbi hissədə qulluq edərkən avtomobil qəzasında həlak olmuşdur. Ailəli idi, bir qızı var.

# Hüseynov Vaqif Şəmil oğlu



Hüseynov Vaqif Şamil oğlu 1971-ci ildə Gədəbəy rayonunun İnəkboğan kəndində anadan olmuşdur. 1988-ci ildə İnəkboğan kənd orta məktəbinin 10-cu sinfini bitirib, ordu sıralarına çağırılıb. Ermənilərin Vətən torpağını ələ keçirməyə can atdıqları zaman Vaqif də ermənilərə qarşı qəhrəmancasına döyüşlərə qatıldı. 1992-ci il avqust ayında Füzuli, 4 aprel 1993-cü ildə Govşadlı kəndində erməni quldurları tərəfindən hücum olan zaman, erməni tankının birini öz köməkçisi ilə qranatamyotla sıradan çıxarıb, erməni tərəfə ağır zərbə endiriblər. Sonra isə Vaqifin köməkçisi olan əsgərin cəsədi tapılıb, Hüseynov Vaqif Şəmil oğlu haqqında heç bir məlumat olmayıb. Vaqif müharibəyə könüllü olaraq getmişdi. İtgin düşüb qayıtmadı. Hal-hazırda valideynlərin gözləri yollardadır ki, Vaqif torpaqlarımızı erməni işğalçılarından azad edib gələcəkdir.

# Hüseynov Zaman Cəlal oğlu

Hüseynov Zaman Cəlal oğlu 1931-ci ildə Gədəbəy rayonunun Hacılar kənd sovetliyinin Əyridərə kəndində anadan olmuşdur. Hərbi xidmətini 3 ilə başa vurduqdan sonra həmin kəndə qayıtmışdır. Ailə qurduqdan sonra kolxozda işləmişdir. El arasında böyük nüfuza malik olmuş, xalqın rəğbətini qazanmışdır. O, 1993-cü ildə erməni quldurları tərəfindən qətlə yetirilmişdir.

# İbrahimov İlham Alı oğlu



İbrahimov İlham Alı oğlu 31 avqust 1974-cü ildə Gədə-bəy rayonunun Sarıköynək kəndində anadan olmuşdur. 1981-ci ildə Dəyirmandağ kənd orta məktəbinin birinci sinfinə getmişdir. 1991-ci ildə həmin məktəbin onuncu sinfini bitirmişdir. 1993-cü ildə hərbi xidmətə yollanmışdır. 27 yanvar 1994-cü il tarixdə Azərbaycan Renspublikasının ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə Füzuli rayonunun müdafiəsində şəhid olmuşdur.

# İbrahimov Nüsrət Vəli oğlu



İbrahimov Nüsrət Vəli oğlu 1973-cü ildə Gədəbəy rayo-nunun Kəlaman kəndində dünyaya göz açıb. 1980-cı ildə Hacıalılar kənd orta məktəbin 1-ci sinfinə daxil olub və 1990-cı ildə həmin məktəbin 10-cu infini bitirib. 1991-ci ildə hərbi xidmətə yola düşüb. 171 saylı hissədə qulluq edib. Gədəbəy rayonunun İvanovka ərazisində yerləşən hərbi bölgənin Hörükdaş və Sarıqaya gedən döyüşlərdə iştirak edib. 1994-cü ildə Kəlbəcər rayonunun Murovdağ əməliyyatında qəhrəmancasına həlak olub. Nüsrət İbrahimov boya-başa çatdığı müddətdə Vətənə, torpağa sədaqət və məhəbbəti həmişə diqqəti

cəlb edirdi. Vətənə xidmət etmək arzusu ilə yaşayan Nüsrət erməni təcavüzkarlarının torpaqlarımıza amansızcasına hücum etdiyi vaxtda – 1991-ci ildə hərbi xidmətə yola düşüb. 1993-cü ilin qış aylarında Nüsrət möhkəm xəstələnərək həkim müayinəsindən keçib müalicə olmaq üçün döyüşdən evlərinə – Kəlaman kəndinə qayıtmışdı. Həkim onun 20-25 gün ciddi müalicə olunmasını bildirmişdi. Nüsrət bu müddətə qala bilmədiyini söyləmiş və “mənim bütün ağrılarım Vətəndir, torpaqlarımızın düşmən ayaqları altında tapdalanmasıdır” demişdir. Müalicəsinin 3-cü günündə döyüş bölgəsinə qayıtmışdır. 1994-cü ilin yanvar ayında erməni düşmənlərinin quduz canavara döndüyü vaxt vəziyyət pisləşəndə Nüsrət öz silahdaşları ilə birlikdə Murovdağa köməyə getmişdir. Onunla gedənlərdən biri də həmkəndlisi Həsənov Eldəniz Novruz oğlu olmuşdur. 1994-cü ilin fevral aymda Nüsrət qəhrəmancasına həlak olmuşdur. Bəli “mənim ağrılarım Vətəndir. Vətən uğrunda ölümdən qorxum yoxdur” deyən oğullar xalqımızın qəlbində əbədi yurd salmış qəhrəmanlardır.

# İskəndərov Azər Qaraca oğlu



İskəndərov Azər Qaraca oğlu 10 fevral 1976-cı ildə Gədəbəy rayonunun Düzyurd kəndində anadan olub. Düzyurd kənd 8 illik məktəbinin birinci sinfinə gedib. 148 saylı Gədəbəy rayonu texniki peşə məktəbini bitirib. Gədəbəy hərbi komissarlığından hərbi xidmətə gedib. Qarabağ uğrunda döyüşlərdə iştirak edib. Subay olub. İəsgəndərov Azər Qaraca oğlu 15.08.1994-cü ildə Şəhid olmuşdur.

## İskəndərov Etibar İsmayıl oğlu

Sıravi Isgəndərov Etibar Ismayıl oğlu 701 saylı hərbi hissədə 3-cü MAT-un əsgəri, 112 saylı 23. 04. 1994-cü il tarixli əmri ilə 2. Təqdimat üçün əsas Sıravi Isgəndərov Etibar İsmayıl oğlu 23.04.1994-il tarixdən 701 saylı hərbi hissədə qulluğa başlamışdır. Xidmət etdiyi müddət ərzində özünü nizam-intizamlı, bacarıqlı, işgüzar bir əsgər kimi göstərə bilmişdir. Qulluq etdiyi müddətdə Ağdam və Tərtər rayonu döyüş əməliyyatları aparılan zonalarda qəhrəmancasına vuruşmuşdur, torpaqlarımızın erməni təcavüzkarlarından azad edilməsində böyük şücaətlər göstərmişdir. Komandirlər tərəfindən verilmiş bütün əmr və tapşırıqları vaxtlı-vaxtında və dəqiq yerinə yetirməklə öz döyüş yoldaşlarına nümunə olmuşdur. Sıravi İsgəndərov Etibar İsmayıl oğlu həmişə ön cəbhədə olmuş, qorxmadan birbaşa ermənilərin müdafiə mövqelərinə girmiş, xeyli miqdarda düşmən texnikasını və canlı qüvvəsini məhv etmişdir. Sonuncu dəfə 05.05.1994-cü il tarixdə Ağdam rayonunun Nəmirli kəndini düşmənlərdən azad edən vaxtı qəhrə-manlıqla həlak oldu. Onun xatirəsi həmişə bizim Briqada tərəfindən fəxrlə yad ediləcəkdir.

Nəticə: Ölümündən sonra “Azərbaycan Bayrağı” ordeni verilməsinə təqdim edirəm.
701 saylı hərbi hissənin komandir əvəzi mayor Qarayev Q. Ş. Etibar İsmayıl oğlu İsgəndərov Sumqayıt şəhərindəki “Şəhidlər xiyabanında” dəfn edilmişdir. Oxuduğu Hacıalılar kənd orta məktəbi hal-hazırda onun adını daşıyır.

## İskəndərov Niyaz Ənvər oğlu



İsgəndərov Niyaz Ənvər oğlu 12 aprel 1972-ci ildə Gədəbəy rayonunun İnəkboğan kəndində anadan olub. 1987-ci ildə ümumi orta məktəbi qurtarıb. 1992-ci il hərbi xidmətə gedib. 1 avqustda Yeni Azərbaycan Ordusunda xidmətə başlayıb. İlk xidməti Şəmkir rayonunun Dəllər qəsəbəsində olub. Təlim keçib. 1992-ci ildə Gədəbəy rayonunun Novoivanovka kəndinə döyüş xidmətinə qayıdıb. 1993-cü ilin iyun ayının 1-də Novoivanovka sərhəd bölgələrində gedən döyüşlərdə cəsurluqla döyüşən zaman 9 nəfər döyüş yoldaşları ilə qəhrəmancasına şəhid olmuşdur.Subay idi. Xatirəsi əbədiləşdirilmişdir. İnəkboğan kənd orta məktəbi 27 avqust 1993-cü ildən onun adını daşıyır.

# İskəndərov Vasif Həbib oğlu



İskəndərov Vasif Həbib oğlu 1975-ci ildə Gədəbəy rayo-nunun Çobankənd kəndində anadan olub. 1981-ci ildə Ço-bankənd orta məktəbinin birinci sinifinə gedib. 1991-ci il-də həmin məktəbin 10-cu sinifini qurtarıb. 1993-cü ildə hərbi xidmətə gedib. 171 saylı hərbi hissədə qulluq etmişdir. 1993-cü ildə Kəlbəcər döyüşlərində fəal iştirak edib. Oradan sonra yenidən 171 saylı hissənin əsgəri kimi Şınıx kəndində gedən döyüşlərdə iştirak etmişdir. 1994-cü ilin dekabr aymda ağır döyüşdə şəhid olmuşdur.

# İskəndərov Yaşar Qara oğlu



İsgəndərov Yaşar 10 sentyabr 1973-cü ildə Gədəbəy rayonunun Arıqıran kəndində anadan olub. 1992-ci ildə orta məktəbi bitirib. Həmin il hərbi xidmətə öz Vətən borcunu verməyə yollanmışdır… Yaşar hərbi xidmətini Ağdamda mina mühəndis batalyonundan başlamışdır. Bir müddətdən sonra Yaşarı Gədəbəy rayonunun Novoivanovka kəndində yerləşən batalyona göndərirlər. Yaşar az vaxt ərzində öz döyüş yoldaşlarınm və rəhbərliyin hörmətini qazanır, baş serjant rütbəsinə yüksəlir. Hərbi qabiliy-yətini nəzərə alan komandanlıq onun sənədlərini 1992-ci il fevral aymda ali hərbi məktəbə hazırlayır. Atalar yaxşı deyib: “Sən saydığım say, görək fələk nə sayır”. Müharibə Yaşarın da taleyinə qələm çəkdi. Cavankən arzularını soldurdu. Yaşar Gədəbəy rayonunun füsunkar təbiəti olan Örükdaş, Keçəldağ, Keçidərəsi və s. yaylaqlarda şücaətlə döyüşdü. O, Keçidərəsi yaylağında ermənilərin mühasirəsində qalan 23 nəfəri mühasirədən qurtarmışdı. Onun son qoçaqlığı isə Xalyarlı deyilən yaylaqda olmuşdu… Yaşar iyunun 29-u 1993-cü ildə batalyona qayıdır və xəbər tutur ki, erməni quldurları Xalyarlı yaylağında qoyun otaran 17 yaşlı iki yeniyetməni öldürüb, camaatın 250 baş qoyununu aparıblar, uşaqların meyidini isə vermək istəmir-lər. Yaşar döyüş yoldaşları ilə hadisə yerinə yola düşür. Dördsaatlıq ağır döyüşdən sonra ermənilər qaçmağa məcbur olur. Uşaqların meyidləri geri alınır. Yaşar isə həmin döyüşdə qəhrəmancasına həlak olur. Ölümündən sonra adı doğma kəndinin məktəbinə verilmişdir. Yaşarın məzarının üstünə belə bir bayatı yazılmışdır: Əziziyəm, bu dağı, Duman aldı bu dağı, Vətən yolunda şəhid oldum, Dərd bilməyin bu dağı.

# İsayev Azər Əli oğlu



Azər ailənin sonbeşiyi idi. Əli kişinin halal ocağında böyümüş bu gənc Gədəbəy rayonunun Əliismayıl kəndinin sayılıb-seçilən oğullarından idi. Kəndin ağsaqqalları onun gələcəyin yaxşı idmançısı, yüksək zövqlü, şair xəyallı, rəssam təbiətli, cəmiyyət üçün gərəkli bir insan olacağını söyləyirdilər. 1990-cu ilin sonlarında respublikamızda yaranmış ağır vəziyyət və erməni separatçılarının törətdiyi cinayətlər barədə məlumatları Azər Qazağıstanda eşitdi. Keçmiş SSRİ-nin Silahlı qüvvələrində qulluq edirdi. Tankçı idi. Azərbaycandakı vəziyyət barədə televiziya ekranlarından söylənən birtərəfli xəbərlər və komandirlərinin verdiyi yanlış məlumatlar onu yaman narahat edirdi. Tezliklə evlərindən məktub aldı və bəzi həqiqətləri də onda bildi. Qəti qərara gəldi ki, vaxt itirmədən doğma Respublikasına qayıtsın, gücünü, biliyini Vətənə həsr etsin. Bu məramla da qərarına əməl edib Azərbaycana qayıtdı. Valideynləri ilə görüşündən bir neçə gün sonra Azər hərbi komissarlığa getdi və özünün tankçı kimi Azərbaycanda istifadə edilməsini xahiş elədi. Təəssüf ki, o zaman bəzi şərəfsizlər onu dinləmək, başa düşmək, texnikanı yaxşı bilən bir mütəxəssis kimi onun qüvvəsindən istifadə etmək əvəzinə, onu min bir çətinliklərə saldılar, təzədən Respublikadan kənara göndərməyə çalışdılar. Amma Azər sözünün üstündə durdu və qətiyyətlə burada qalmaq istədiyini bildirdi. Onu Şınıx bölgəsində yerləşən ordu bölməsinə göndərdilər. Hərbi xidmətinin qalan hissəsini orada qulluq elədi və bir ulu Tanrı bilir ki, bu müddətdə Azər erməni fitnəkarlıqlarının qarşısının alınması üçün nə qədər işlər gördü, oradakı nə qədər hərbi texnikanın Ermənistana daşınması planını pozdu. 0 zaman rus komandirləri məzuniyyət adı ilə onu tez-tez evə buraxsalar da, Azər bundan imtina edir və

həmişə hərbi hissədə qalırdı. Xidmət müddəti qurtarandan sonra da evlərində qərar tuta bilmədi. Alçaq ermənilərin doğma Qarabağda cövlan eləməyini qeyrətinə sığışdırmadı. Qarabağa getməyi qərara aldı: “Əsl müharibə orada gedir. Bütün bu oyunlar Qarabağın başındadır, oranı xilas etməliyik” – dedi. Anası Azəri heç olmasa bircə ay yanında saxlamaq istəyirdi. Mümkün olmadı. Müharibənin az-çox nə olduğunu yaxşı bilən Azər anasına təskinlik vermədən həqiqəti söylədi: “Ana, Vətənə vuruşan oğullar gərəkdir. Mən evdə otura bilmərəm. Hesab elə ki, məni bu Vətənə qurban demisən”. Bəlkə də onu qarşıda gözləyən şəhidlik taleyini fəhmlə duyduğundan bu sözləri söyləmişdi və anasını da bu dərdi çəkməyə hazırlayırdı. Azər İsayev bundan sonra Lənkəran batalyonunun tərki-bində Qarabağ cəbhəsinə yola düşdü. 1992-ci ilin avqust ayında Drombon, Mehmanə, Çıldıran kəndləri uğrunda aparılan ağır döyüşlərdə iştirak etdi. Artıq Azərgilin döyüşçüləri Xankəndi yolunda sonuncu strateji əhəmiyyətli Vənkli kəndinə çıxmışdılar. Mahir nişançı olduğuna və texnikadan başı yaxşı çıxdığına görə yoldaşları arasında xüsusilə fərqlənirdi. Həmin kəndlərin azad olunmasında da qəhrəmanlıq nümunələri göstərmişdi. Ancaq o zaman cəbhədəki müəyyən intizamsızlıq halları Azəri heç cür açmırdı. Çox böyük çətinliklərlə əldə edilmiş mövqelərin əldən verilməsinin və itkilərimizin də böyük hissəsinin adi intizamsızlıqdan, yaxud təcrübəsizlikdən baş verdiyini Azər yaxşı görür və çıxış yolu tapmağa çalışırdı. Buna görə də yaxın silahdaşları ilə birlikdə “Qızılbaşlar” dəstəsində birləşdilər. And içdilər ki, düşmənə arxa çevirməyəcəklər, fərarilik etməyəcəklər, silahdaşlarını döyüş meydanında qoyub qaçmayacaqlar. Tezliklə bu dəstənin şöhrəti hər tərəfə yayıldı.
Çıldıran ətrafındakı qanlı döyüşlər isə təzədən bərpa olunmuşdu. “Qızılbaşlar” böyük iradə və inamla döyüşür, düşmənə ciddi zərbələr vururdular. Sentyabrın 2-də Azər üç yoldaşı ilə kəşfiyyata çıxmışdı. Yoldaşlarından biri müşahidə aparmaq üçün yaxındakı aşırıma getmişdi. Müəyyən edilmiş vaxt keçsə də o hələ geri qayıtmırdı. Axtarışlar da bir nəticə vermədi. Kəşfiyyat vaxtı qurtardığına görə yoldaşları geri qayıtmağı təkid etsələr də, Azər razılaşmadı: “Biz and içmişik, yoldaşlarımızı axtarıb tapmalıyıq”. Qəfildən iki tərəfdən güclü atəşə düşdülər. Mühasirədə olan bu üç qeyrətli oğul 50-yə yaxın düşmən əsgəri ilə qeyri- bərabər döyüşdə yarım gün öz mövqelərini qorudular, çoxlu düşmən qüvvəsini məhv etdilər. Ancaq bu Azər üçün sonuncu döyüş oldu. Qılçasından və onurğa sümüyündən ağır güllə və qəlpə yaraları alan Azəri ilkin əməliyyatdan sonra vertolyotla Bakıya gətirdilər. O, 34 gün güclü

ağrılara dözdü. Bəzən doğma və yaxınlarının çəkdiyi sıxıntını hiss edən Azər öz ağrılarını unudub onlara ürək-dirək verirdi: – Fikir eləməyin, mən özümün və həlak olmuş dostlarımın qisasını azı onqat almışam. Bir də tez-tez döyüş yoldaşlarmı xatırlayır, onlardan yaman nigaranam, deyirdi. Həkimlər onun həyatı uğrunda bütün vasitələrdən istifadə etsələr də, bu qəhrəman oğulu xilas etmək mümkün olmadı.... Oktyabrın 6-da Azər doğmaları ilə son dəfə vidalaşdı. Əbədiyyətə qovuşdu, şəhidlik zirvəsinə köçdü. Oktyabrın 8-də Gədəbəyin “Şəhidlər xiyabanı”nda böyük izdaham vardı. Onun haqqında söz demək istəyənlərin sayı çox idi. Rayon hərbi komissarı, Azərin döyüş yoldaşları onun qəhrəmanlıqlarından danışırdılar. Ana torpaq isə daha bir igidini qoynuna alırdı…



## İsayev Şükür Səfxan oğlu

İsayev Şükür Səfxan oğlu 1969-cu ildə Gədəbəy rayonunun İsalı kəndində fəhlə ailəsində anadan olmuşdur. 1976-cı ildə məktəbə getmiş, 1987-ci ildə məktəbi qurtarmışdır. 1988-ci ildə hərbi xidmətə getmiş, iki il Rusiyada hərbi xidmətdə olmuşdur. Könüllü olaraq 1992-ci ildə Azərbaycan Respublikasının torpaqlarını qorumağa getmişdir.İsayev Şükür Səfxan oğlu Örükdaş, Kaftar, İsgəndər qalası, Hacıroun üstündə, sonra Göyəllidə postda olmuşdu. Göyəllidə olarkən erməni quldurları tərəfindən 1994-cü il-də qətlə yetirilmişdir. Ailəsi var idi. 2 övlad atası idi.

## İsmayılov Kəmaləddin Rəhim oğlu



İsmayılov Kəmaləddin Rəhim oğlu 1968-ci il mart ayının 6-da Gədəbəy rayonu Ərtəpə kəndində anadan olub. 1974-cü ildə Ərtəpə

kəndində birinci sinfə gedib, 1981-ci ildə Ərtəpə kənd natamam məktəbini bitirib. 1983-cü ildə Söyüdlü kənd orta məktəbini bitirib. 1984-cü ildə Gədəbəy rayonu hərbi komissarlığı tərəfindən hərbi xidmətə çağırılıb. 1986-cı ildə hərbi xidmətdən qayıdıb. 16.08.1992-ci ildən könüllü olaraq Milli Qvardiyada qulluq edib. 4 iyun 1993-cü ildə Gəncədə vəfat edib.

# İsmayılov Füzuli Xudayət oğlu



İsmayılov Füzuli Xudayət oğlu 1974-cü il martın 28-də Gədəbəyin Şura kəndində anadan olmuşdur. 1992-ci il avqustun 20-də hərbi xidmətə yola düşən Füzuli altı ay təlim keçdikdən sonra serjant rütbəsində döyüş bölgələrinə yola düşür. Əvvəlcə Qusar batalyonunda, sonra isə Tərtər batalyonunun tərkibində xidmət edir. 1993-cü ilin avqust ayına qədər bu batalyonun tərkibində döyüşür. Sonra isə Beyləqan, Füzuli istiqamətində gedən döyüşlərdə N saylı hərbi hissənin tərkibində “İstehkamçılar” taburunda xidmət edir. Aşagıdakı sətirlər sıravi əsgər Füzuli İsmayılova həmin hissənin komandirliyi tərəfindən verilmiş xasiyyətnamədən götürülmüşdür. Füzuli İsmayılov “İstehkamçılar” taburunda xidmət etdiyi dövrdə öz hərbi peşəsinin dərin sirlərini öyrənmiş, yoldaşları tərəfindən sevilmiş və komandirin verdiyi tapşırıqları bir igid əsgər kimi vaxtında yerinə yetirmişdir. Sıravi əsgər F. İsmayılov öz hərbi peşəsinin sirlərini yoldaşlarına da öyrədir və onlarda erməni işğalçılarına qarşı nifrət hissi aşılayırdı. Öz döyüş yoldaşları ilə birgə dəfələrlə hərbi əməliyyatlarda olub. Düşmənin dərin mövqelərində qurduqları minalarla onlarla texnika və canlı qüvvə məhv etmişdir.Füzuli İsmayılov əsl vətənpərvər insan idi. Qəlbində bir müqəddəs arzusu vardı: İşğal altında inləyən torpaqlarmızın azad olunması. Bu arzu ilə yaşayan Füzuli ölümün gözünə dik baxmağı bacardı. 1994-ci il yanvarın 12-də gözlərini əbədi yumdu. Heyf, min heyf ki, əsgərlərimiz bu qorxmaz əsgərin meyidini götürə bilmədilər. Amma təsəllimiz ondadır ki, Füzulinin qəlbində gəzdirdiyi müqəddəs arzusu çin olacaq. Canından artıq sevdiyi Vətən torpağı erməni vəhşilərindən xilas olacaq.

## İsmayılov İspəndiyar Namaz oğlu



İsmayılov İspəndiyar Namaz oğlu 1975-ci ildə Çobankənd kəndində anadan olub. 1993-cü ildə hərbi xidmətə gedib. Kəşviyyatda qulluq edib. Sərhədlərdə daimi döyüşlərdə olub. 1994-cü ilin 16 avqustunda kəşfiyyata çıxıb və həmin vaxt erməni sərhədlərində minaya düşüb şəhid olmuşdur.

## İsmayılov Kəmaləddin Rəhim oğlu



İsmayılov Kəmaləddin Rəhim oğlu 1968-ci il mart ayının 6-da Gədəbəy rayonu Ərtəpə kəndində anadan olub. 1974-cü ildə Ərtəpə kəndində birinci sinfə gedib, 1981-ci ildə Ərtəpə kənd natamam məktəbini bitirib. 1983-cü ildə Söyüdlü kənd orta məktəbini bitirib. 1984-cü ildə Gədəbəy rayonu hərbi komissarlığı tərəfindən hərbi xidmətə çağırılıb. 1986-cı ildə hərbi xidmətdən qayıdıb. 16.08.1992-ci ildən könüllü olaraq Milli Qvardiyada qulluq edib. 4 iyun 1993-cü ildə Gəncədə vəfat edib.

## İsmayılov Natiq Həsrət oğlu



İsmayılov Natiq Həsrət oğlu 1974-cü ilin 2 avqustunda Gədəbəy rayonunun Böyük Qaramurad kəndində doğulub. 1980-ci ildə orta məktəbə gedib, 1991-ci ildə qurtarıb. 1993-cü ilin 10 yanvarında Azərbaycan Ordusuna çağırılıb. Qusar hərbi hissəsində, Gədəbəyin Şınıx bölgəsində hərbi xidmətini davam etdirib. Orta təhsilli idi. Ailə qurmamışdı. 25 mart 1994-cü ildə Kəlbəcər döyüşlərində şəhid olmuşdur. Ailənin böyük oğlu idi. Orta məktəbdə və ordu sıralarında özünün məharətinə görə hörmət qazanmışdı. Natiq sadə qəlbli gözəl bir oğlan idi. O, həmişə deyərdi: “Xocalı qırğınına, ana-bacıların ah-naləsinə dözə bilmirəm. Mən mütləq bu nankorlardan qisasımı almalıyam. Onun döyüş amalı da elə bu idi”. Böyük Qaramurad mədəniyyət evi hazırda onun adını daşıyır.

# İsmayılov Rəfail Əsəd oğlu



İsmayılov Rəfail Əsəd oğlu 1971-ci il aprel ayının 23-də Şəmkir rayonunun Zəyəm Çirdaxan kəndində anadan olmuşdur. 1978-ci ildə Gədəbəy rayonunun 2 saylı Qoşabulaq kənd orta məktəbinin 1-ci sinfinə getmişdir. 1988-ci ildə həmin məktəbin 10-cu sinfini bitirmişdir. 1989-cu ildə Rusiyaya hərbi xidmətə getmişdir. 1991-ci ildə hərbi xidmətdən gəlmişdir. 1992-ci ildə könüllü olaraq Azərbaycan Ordusunda xidmətə başlamışdır. 30 fevral 1992-ci ildə Qubadlı rayonunda şəhid olmuşdur.

# İsayev Etibar Eldar oğlu



İsayev Etibar Eldar oğlu 25 mart 1970-ci ildə Gədəbəy rayonunun Kiçik Qaramurad kəndində anadan olmuşdur. 1977-ci ildə Nizami adına Kiçik Qaramurad kənd orta məktəbinin 1-ci sinfinə getmiş və 1987-ci ildə həmin məktəbi bitirmişdir. 1988-ci ildə sürücülük kursunu bitirdikdən sonra Sovet ordusu sıralarında hərbi xidmətini Almainyada keçirmişdir. Hərbi

xidmətdə yaxşı qulluq etdiyinə görə tərifnamələr verilmiş və ailəsinə təşəkkürnamələr göndərilmişdi. Hərbi xidməti başa vurduqdan sonra Sumqayıt şəhərində yağ-piy zavodunda sürücü işləmişdir. Quldur ermənilərin torpaqlarımıza soxulması yüzlərlə gənclərimiz kimi onuda rahat buraxmadı. Könüllü olaraq Vətənimizin müdafiəsinə qalxdı. O, əvvəlcə Qubadlının müdafiəsində döyüşdü və bir neçə erməni tankını partlatdı. Yoldaşları onu gecə quşu, tank partlatmaq ustası kimi tanıyırdılar.
Sonra Etibar Ağdamın Mərzili və Seyidli kəndləri uğrunda gedən vuruşlarda mühasirəyə düşmüş yoldaşlarını mühasirədən azad etmiş və düşmənin çoxlu canlı qüvvəsini məhv etmişdir. Bu vuruşda göstərdiyi şücaətə görə ona baş çavuş rütbəsi verilmiş və xüsusi fəxri fərmanla təltif edilmişdir. Etibar İsayev öz döyüş yoldaşları ilə Kəlbəcər bölgəsində döyüşlərdə də fəal iştirak etmişdir. Azərbaycan xalqının mətin oğlu Etibar İsayev Murovdağ istiqamətindəki qarlı-şaxtalı günlərdə gedən ağır vuruşmalarda 1994-cü il fevral ayının 17-də itkin düşmüşdür. Xalqımız onun adını əbədiləşdirərək Sumqayıt şəhərində öz yaşadığı 2mr.II/17-ci binanın önünə xatirə lövhəsi vurmuşdur.

# Kərimov Mahir Nurəddin oğlu



Kərimov Mahir Nurəddin oğu 1974-cü ildə Gədəbəy rayonunun Qarıkənd kəndində anadan olub. O, 1989-cu ildə Qarıkənd məktəbini, 1991-ci iidə Gərgər kənd orta məktəbini bitirib. 1992-ci ildə hərbi xidmətə çağırılıb. Vətənimizin bütövlüyü uğrunda gedən mübarizədə 171 saylı hərbi hissənin tərkibində işğalçı erməni ordusuna qarşı aparılan bir neçə ağır döyüşlərdə mərdliklə vuruşub. Vətən sevgisi Mahiri həmişə irəli düşmən üzərində qələbəyə aparırdı. 1992-ci il avqustun 11-də Azərbaycan Respublikasınm ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə şəhid olmuşdur. Həyatının təzəcə çiçəkləndiyi bir vaxtda ömrünü Vətənin, xalqının yolunda qurban verdi.

## Kovesnikov Vladimir Stepanoviç



Kovesnikov Vladimir Stepanoviç 1973-cü il iyunun 21-də Gədəbəy rayonunda Novosaratovka kəndində anadan olub. Novosaratovka kənd orta məktəbini bitirib. 1991-ci ilin noyabr ayında hərbi xidmətə çağırılıb. 1992-ci il avqust ayının 7-də İvanovka kəndində gedən döyüşdə şəhid olub. O ailə həyatı qurmamışdı.

## Qasımov Arzu Məcid oğlu



Qasımov Arzu Məcid oğlu 1973-cü ildə Gədəbəy rayonunun Əlismayıl kəndində anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra 1992-ci ildə hərbi xidmətə çağırılan Arzu Gədəbəy özünümüdafiə batalyonunda xidmət etməyə başladı. Ay yarım qulluq etdikdən sonra könüllü olaraq İvanovka bölgəsindəki döyüşlərdə iştirak edir. Başkənd, Mutudərə döyüşü əməliyyatlarında cəsur döyüşçü kimi igidliklər göstərir. 1992-ci ildə Sarıqaya ətrafında gedən döyüşlərdə şəhid olmuşdur. İndi vaxtilə Arzunun təhsil aldığı Əlismayıl kənd orta məktəbi onun adnı daşıyır. Subay idi. Atası Məcid kişinin dediklərindən: “Oğlumu 18 yaşına kimi böyütmüşəm ki, Vətənə layiq oğul olsun. Hələ orta məktəbi bitirməmiş hərbi xidmətə gedən Arzunun döyüş dostları və komandirləri arasında böyük hörməti vardı. Fəxr edirəm ki, oğlum

torpaqlarımızın bütövlüyü uğrunda gedən mübarizədə şəhid olmuşdur”.

## Qasımov Cilingir Mayıl oğlu



Qasımov Cilingir Mayıl oğlu 16 sentyabr 1981-ci ildə Hacılar Sovetliyinin Qaravəllər kəndində anadan olub. 1987-ci ildə Qaravəllər kənd orta məktəbinin birinci sinfinə gedib. Döyüş ərazisində yaşadığına və atası zabit olduğuna görə sərrast atıcı idi. 1993-ci il 17 oktyabrda post qurmaq üçün hərbçilər Seyidtala adlı ərazidən traktorla ağac çıxarmağa gedən zaman balta lazım olduğuna görə leytenant Paşayev Yusif çağırıb Qasımov Cilingiri də özünlə aparıb. Hərbçilərin başı işə qarışan vaxt mühasirəyə düşdüklərini on iki yaşlı Qası-mov Cilingir bilib. Silahı götürüb düşmənə tərəf gedib. Düşmənlə atışıb, əsgər Mehtiyev Qurban yaralanıb. Qasımov Cilingirin köməkliyi ilə hərbçilər, kəndin mal-qoyunu və onları otaran şəxslər xilas olunub, özü isə həmin yerdə odlu silahla öldürülüb. Hərbçilərin köməyi ilə meyidini Nəbiyev Azad çıxarıb.

## Qasımov Eldəniz Şahbaz oğlu



Qasımov Eldəniz Şahbaz oğlu 26 mart 1973-cü ildə Slavyanka kəndində anadan olmuşdur. 1988-ci ildə Slavyanka kənd orta məktəbini bitirmişdir. 1988-ci ildən 1991-ci ilədək Gədəbəy rayonu peşə məktə-bində oxuyub geniş profilli traktorçu peşəsi üzrə tam kursu bitirmişdir. 1991-ci ildə ordu sıralarına çağrılmışdır. Əvvəlcə Bakı şəhərində qulluq etmiş, sonra isə könüllü olaraq Gədəbəy bölgəsinə gəlmişdir. 18 iyun 1992-ci ildə Gədəbəy bölgəsində

Azərbaycan Respublikasının Suverenliyi uğrunda gedən döyüşlərdə həlak olmuşdur.

## Qasımov Əkbər Göyüş oğlu



Qasımov Əkbər Göyüş oğlu 3 sentyabr 1970-ci ildə Gədəbəy rayonunun Arabaçı kəndində anadan olub. 1977-ci ildə Arabaçı kənd orta məktəbinin birinci sinfinə gedib, orta məktəbi 1987-ci ildə bitirdikdən sonra avtomobil sürücülüyü kursunu oxuyub. 1988-ci ilin dekabr ayında Sovet Ordusuna çağırılıb. 26 oktyabr 1990-cı ildə ordudan təcxis olunub. Qarabağın üstünü qara buludlar alanda Vətənin köməyinə tələsib. 002 nömrəli hərbi hissədə qulluq edib. Əkbərin xidmət etdiyi alay döyüşlərdə həmişə fərqlənirdi. Çünki onun tərkibində Əkbər kimi qəhrəman oğullar döyüşürdü. 1993-cü ilin 19 yanvarı… Əsgərlərimiz Fərrux dağı ətrafında düşmənə qan uddururdu. Əkbər və yoldaşları igidliklə döyüşürdülər. Amma düşmən gülləsi igid oğlumuzu vaxtsız ayırdı yoldaşlarından, Əkbər qəhrəmancasına şəhid oldu. Bu itki, bu ağrı təkcə gədəbəyliləri deyil, Əkbəri tanıyıb qəhrəmanlığına bələd olan minlərlə adamı ağlatdı. Səni Vətən unutmayacaq, Əkbər, rahat uyu, torpağın yüngül olsun!

## Qasımov Faiq İsrafil oğlu



Qasımov Faiq İsrafil oğlu 10 may 1970-ci ildə Hacılar sovetliyinin Qaravəllər kəndində kolxozçu ailəsində anadan olub. 1977-ci ildə Qaravəllər kənd orta məktəbində birinci sinfə gedib, 1987-ci ildə orta məktəbi bitirib. 1988-ci ildə Gədəbəy rayon hərbi komissarlığı onu hərbi xidmətə çağırıb. 1990-cı ildə hərbi xidmətdən qayıdıb. 1990-cı ildə Gəncədə Azərbaycan Dövlət Pedaqoji institutunu bitirmişdir. İnstitutu qurtarandan sonra Qaravəllər kənd orta məktəbində müəllim işləmişdi. 1993-cü ildə könüllü olaraq hərbi xidmətə gedib. 1994-cü ildə erməni quldurları basqın edərkən odlu silahla öldürülmüşdür.

# Qasımov Möhsüm Mansur oğlu



Qasımov Möhsüm Mansur oğlu 1961-ci ildə Gədəbəy rayonunun Düzyurd kəndində anadan olub. Gədəbəy şəhəri orta məktəbini bitirib. Ali təhsil aldıqdan sonra Gədəbəy peşə məktəbində müəllim işləyib.
1992-ci ildə Gədəbəy hərbi komissarlığından könüllü olaraq hərbi xidmətə gedib. 1995-ci ildə Gədəbəy bölgəsində vəfat edib.

# Qasımov Natiq Səlim oğlu



Taleyin burulğanına düşmüş bir Azərbaycan oğlu, cəsur bir döyüşçü... Qısa tərcümeyi halı var onun: 1971-ci ildə Gədəbəyin Kiçik Qaramurad kəndində anadan olub. Bir neçə ildən sonra ailələri Mingəçevir şəhərinin Energetiklər qəsəbəsinə köçüb, orada məskunlaşıblar. Atası stansiyada fəhlə işləyirdi... Bəli, anamız Odlar diyarının başı üstünü qara buludlar alanda minlərlə Vətən oğlu kimi Natiq də döyüş meydanına atıldı. Silaha sarılıb doğma Vətəni qorumağa başladı. Ağdam bölgəsində vuruşurdu. 1992-ci ilin mart ayının əvvəllərində döyüşçü dostları ilə birlikdə onlar tapşırıq almışdılar ki, uca dağ zirvəsində yerləşən kilsəni ələ keçirsinlər. Döyüşçülərin əməliyyatı uğurlu keçmiş, onlar məqsədlərinə nail olmuşdular. Bunu görən erməni quldurları kilsəni ələ keçirməyə cəhd göstərsələr də bu baş tutmamışdı. Diqqət yetirin, bu barədə görün "Oqonyok" jurnalında (1992-ci il № 14-15) dərc olunmuş yazıda Konstantin Smirnov nə yazır: "Tezliklə biz

Stepanakertdən Əskərana tərəf yollandıq. Oradan vaxtaşırı atışma səsləri gəlirdi. Lakin Əskərana gedib çıxmadıq, çünki yolda silahlı saqqallılarla dolu BTR-ə rast gəldik. Şübhəsiz, buradakı dəstənin yaraqlıları iş dalınca gedirdilər. Onların aldıqları məlumata görə, bir neçə gün bundan əvvəl əks tərəf dağlarda kənd tutmuşdu. Ermənilər onları oradan sıxışdırıb çıxarsalar da köhnə Qriqoryan kilsəsində Azərbaycan Milli Ordusunun bir qrup “boeviki” qalmışdı. BTR-dəki adamlar ən uca zirvədə yerləşən kilsəni azad etməyə yollanırdılar. Kiçik kilsədə azərbaycanlıların sayı heç kimə məlum deyildi. Lakin onlara hücum edən dəstə dünən artıq iki nəfəri itirmişdi. Ermənilər müxtəlif vasitələrdən – gözyaşardıcı qazdan, qumbaralardan istifadə etsələr də məqsədlərinə nail ola bilmədilər. Təəssüf ki, hadisə yerinə çata bilmədik – maşınımız dağın ətəyindəki yolda bataqlığa düşdü və BTR gözdən itdi. Buna baxmayaraq, o, böyük əks-sədaya səbəb oldu. Belə ki, nə bu gün, nə də ertəsi yaraqlılar kilsəni ələ keçirə bilmədilər. Yalnız üçüncü cəhddən sonra onlar kilsənin yeganə sağ qalmış müdafiəçisini təslim olmağa vadar etmiş və məbədlə qəbiristanlığı geri qaytarmışlar. Əsir düşmüş cavan oğlan (red – çox təəssüflər olsun ki, Natiqin həmin anda çəkilmiş fotoşəklini çap etmək imkanımız yoxdur) tüstüdən qapqara idi. O, üzərində yaşıl bayraq sancılmış kilsədə beş gün ac-susuz qalmışdı. Şəkildə (dərc edə bilmədiyimiz – red) bu oğlan erməni yaraqlılarının müşaiəti ilə Azərbaycanın səkkizguşəli bayrağını aparır. Onu hara aparırlar, taleyi necə olacaq? Əsiri yoldaşlarının meyidləri yanında aparırdılar, aşağıda, dağların qoynunda isə onun Vətəni Azərbaycan görünürdü…”

Mənim xalqımın ər oğulları ana-bacılarını sevdikləri qədər də doğma torpaqlarını sevirlər. Onun yolunda nə əsirlikdən, nə məşəqqətdən, nə də ölümdən belə qorxmurlar. Təki xalqımız azad nəfəs alsın, firavan, sülh və əmin-amanlıq şəraitində yaşasın! Yenicə dünyaya göz açan körpələrimiz top-tüfəng səsindən diksinib ayılmasm! Görün torpaqlarımızın düşmən tapdağından qorunması üçün indiyədək quldurlarla müharibədə necə-necə Natiq kimi oğullarımız əsir düşüb, həlak olub, qətlə yetiriliblər. Müdrik bir xalqın başına açılan müsibətlər bizi rahat buraxa bilərmi? Susa biləri kmi? Dalbadal törədilən faciələr, dəhşətlər unudulasıdırmı? Sonra bizə nə ad verərlər?

Bəli, Natiq düşmən qarşısındakı bu hərəkəti ilə gənc nəslimizin tarixinə bir səlnamə də əlavə etdi. Ucaltdı bu nəslin adını. Qoca tarixin yaddaşında həkk elədi. Unudulmaz, yaddan çıxarılmazdır Natiqin qurduğu bu qeyrət qalası! Bütün Azərbaycan oğullarını,

ordumuzun döyüşçülərini Natiq kimi şirürəkli olmağa çağırırıq. Budur, bu torpağın öyünc, güvənc yeri! Natiq kimi oğulları olan torpağa düşmən bata bilməz, xain ayaq aça bilməz! Yazını işləyə-işləyə düşünürəm, düşündükcə də yenilməz bir qəhrəmanın haqqında başladığım bir hekayətə son qoymağa əlim gəlmir. Daha doğrusu, bunu bacarmaq çətindir. Çətindir, belə şanlı ömrün kiçik tarixçəsindən doğmuş böyük, ülvi bir səlnaməni başa çatdırmaq. Qınamayın qələm sahiblərini! Qınamayın… Təkrar da olsa deməliyəm ki, daxilimdə baş qaldıran hisslər, fikirlər məni son bir qərara gəlməyə vadar etmişdir: “Natiq kimi qeyrət qalası məhv edilə bilməz! Natiq ölə bilməz! Natiq “yandırıla, itkin düşə” bilməz! O, sağ-salamat-dır! Daim öz məğrur baxışları ilə iki quldurun arasından bizi qeyrətə, cəsarətə çağırır: “Mənim kimi olun: mənim kimi hərəkət edin. Qoy torpaq, ana Vətən sizə öz köksündə yaşamağa haqq versin! ” – deyir.” Telman Səmədoğlu “Şimşək çaxır dağlarda” kitabından. 1995-ci il. Xocalı qaçqını, dil-ədəbiyyat müəllimi Cəfərov Cəfər müəllimin dedikləri: – Bizi, yəni 22 nəfər xocalılını tutub Əscgərana gətirdilər. Bir neçə gün orada qaldıqdan sonra, bir səhər bizi cərgəyə düzdülər. Erməni zabiti mənə yaxmlaşıb dedi ki, səni Qriqoryan kilsəsinə aparıram, kilsənin içərisində döyüşçülər var. Onlar bizə müqavimət göstərirlər. Sən kilsənin içərisinə daxil ol və onlara təslim olmalarını de. Əgər onlar təslim olmasalar sizi və 22 nəfər Xocalı sakinini güllələyəcəyik. Təslim olsalar sizi azad edəcəyik. Məni Qriqoryan kilsəsinə apardılar. Kilsədən aralı maşını saxlayıb düşürdülər və kilsəyə girməyimi əmr etdilər. Mən kilsəyə daxil olanda kilsədən səs gəldi. Mən tez azərbaycanlı olmağımı dedim və onu da dedim ki, əgər o təslim olmasa 22 nəfər Xocalılını öldürəcəklər. O, bir nəfər olduğunu və beş gündür ki ac-susuz tək döyüşdüyünü bildirdi. Onun rəngi hisdən qapqara olmuşdu. Mən ermənilərin fikrini ona bildirdim. O, bir an fikrə getdi. Sonra Azərbaycanm bayrağını kilsənin üstündən çıxardı. İki gülləsi qalmışdı, onu da havaya atdı və kilsədən çıxdı. O, razı olmadı ki, Xocalıları güllələsinlər. Azərbaycanm bayrağnıı sinəsinə sıxıb ermənilərin üzərinə getdi.
Orada coxlu meyitlər var idi. Biz meyitlərin yanından enib kilsədən aralandıq. Orada çoxlu xarici jurnalistlər də var idi. Onlar Natiqin şəklini çəkdilər. Mən onun haralı olduğunu və adını kilsədə öyrənmişdim. Bu şəkillərdən biri “Oqonyok” jurnalında dərc olunmuşdu. Bizi sonra ayırdılar. Məni Əsgərana, onu isə Xanabada apardılar. Bu ifadə Azərbaycan Dövlət Milli Təhlükəsizlik Nazirliyində var.

# Qasımov Səyavuş Qəzənfər oğlu



Qasımov Səyavuş Qəzənfər oğlu 1973-cü ildə avqust ayının 16-da Gədəbəy rayonunun Arabaçı kəndində anadan olmuşdur. 5 may 1992-ci ildə könüllü olaraq Azərbaycan Ordusuna hərbi xidmətə yollanıb. İlk təhsilini Ağdamda alıb. Cəmi on gün döyüşüb. Lakin on gün də kifayət idi ki, Səyavuş öz ana torpağına, Vətənə məhəbbət və sədaqətini, cəsurluğunu nümayiş etdirsin. 1995-ci il mayın 15-də Ağdam uğrunda gedən döyüşlərdə şəhid olub. Hazırda şəhid Səyavuş Qasımovun məzarı doğma Arabaçı kəndindədir. Səyavuş Qasımovun adı əbədiləşdirilərək vaxtilə oxuduğu Arabaçı kənd orta məktəbinə verilib. Anası Simüzər xala (atası Qasımov Qəzənfər 1995-ci ildə vəfat edib), qardaşları Nuşirəvan, Xosrov, Həzi, bacıları Validə, Xəyalə onunla təskinlik tapırlar ki, vaxtilə bir ailənin övladı olan Səyavuş indi bütün el-obanın, Vətənin oğludur. Şirin xatirələrə dönüb yaddaşlarda əbədi yaşayacaq Səyavuş!

# Qayıbov Rizvan Nüsrət oğlu



Qayıbov Rizvan Nüsrət oğlu 1965-ci ildə Gədəbəy rayonunun Kiçik Qaramurad kəndində anadan olmuşdur. 1972-ci ildə Nizami adına kənd orta məktəbin birinci sinfinə getmiş, 1982-ci ildə həmin məktəbi bitirmişdir. 1983-1985-ci il tarixdə Sovet ordusu sıralarında qulluq etmişdir. Ordudan qayıtdıqdan sonra Sumqayıt şəhərində şüşə zavodunda işləməyə başlamış və 1989-cu ildə

ailə həyatı qurmuşdur. İki evladı var. Qayıbov Rizvan Nüsrət oğlu Qarabağ uğrunda gedən döyüşlərə könüllü olaraq getmişdir. 1994-cü il 4 yanvarda Beyləqan uğrunda gedən döyüşlərdə şəhid olmuşdur.

# Qəhrəmanov Bilal Qəhrəman oğlu



Qəhrəmanov Bilal Qəhrəman oğlu 1969-cü il iyunun 2-də Gədəbəy rayonunun Yenikənd kəndində anadan olub. Orta məktəbi müvəffəqiyyətlə başa vurduqdan sonra 1987-89-cu illərdə Sovet ordusu sıralarında hərbi xidmətdə olub. 1991-ci ildə könüllü Azərbaycanın müdafiəsinə qalxanlardan biri olub. Ağdam, Ağdərə, Ağcabədi istiqamətlərində gedən dö-yüşlərdə dəfələrlə fərqlənmişdir. 1994-cü il yanvarın 4-də düşmənin xeyli texnikası və canlı qüvvəsini məhv edərək, həyatı bahasına öz döyüş yoldaşlarını xilas etmiş, özü isə qəhrəmancasına həlak olmuşdur. Ölümündən sonra “hərbi xidmətə görə” medalı ilə təltif olunmuşdur. Yenikənd orta məktəbi bu cəsur döyüşçünün – tağım komandiri çavuş Qəhrəmanov Bilal Qəhrəman oğlunun adını daşıyır.

# Qəhrəmanov Kamran Qulu oğlu



Qəhrəmanov Kamran Qulu oğlu 10 yanvar 1974-cü il tarixdə Gədəbəy rayonunun Hacıələkbərli kəndində müəllim ailəsində anadan olmuşdu. 1980-ci ildə Hacıələkbərli kənd ibtidai məktəbinin birinci sinfinə daxil olmuşdur. Təhsilini davam etdirmək üçün 1984-cü dərs ilində Dəyirmandağ kənd orta məktəbinin beşinci sinfinə daxil olmuş və həmin məktəbin XI sinfini 1991-ci ildə bitirmişdir. 1991-ci ildə Gədəbəy rayon hərbi komissarlığının göndərişi ilə Gəncə şəhərində altı aylıq sürücülük kursunu qurtaran

kimi, 27 iyun 1992-ci il tarixdə Gədəbəy rayon hərbi komissarlığından hərbi xidmətə yola salınmışdır. Azərbaycanın ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə Ağdərə rayonun Sırxavənd kəndində erməni işğalçılarına qarşı hərbi əməliyyat vaxtı itgin düşmüşdür. Həmin vaxtdan yəni 20 yanvar 1992-ci il tarixdən bu günə qədər onun taleyi barədə heç bir məlumat yoxdur.

## Qəhrəmanov Mehman İmamverdi oğlu

Qəhrəmanov Mehman İmamverdi oğu 1961-ci ildə Gədəbəy rayonunun Göyəlli kəndində anadan olub. 1992-ci ildə hərbi xidmətə könüllü olaraq getmişdir. Ailəli olub. 3 övladı var. 1994-cü ildə avqust ayının 6-da Sümüklü postu uğrunda gedən döyüşdə həlak olub. Döyüş yolu Sümüklü, Yəhərli, Tərsboyun dağlarında keçmişdir. Bütün döyüşlərdə o həmişə mərdliklə döyüşmüşdür. Qəhrəmanov Mehman, onu tanıyanların qəlbində həmişə yaşayacaqdır. Qəbrin nurla dolsun!

## Qəşəmov Səfər Əmiraslan oğlu

Qəşəmov Səfər Əmiraslan oğlu 1972-ci ildə Gədəbəy rayonunun Qaravəlilər kəndində anadan olmuşdur. Təhsilini Qaravəlilər kənd orta məktəbində almışdı. Təhsilini başa vurduqdan sonra, hamı kimi o da Vətənin azadlığı uğrunda könüllülər cərgəsinə qoşuldu. Erməni qəsbkarları təzə-təzə öz təcavüzkar niyyətlərini həyata keçirməyə başlamışdı. Səfərin dünyaya göz açdığı Qaravəlilər kəndi Ermənistanla həmsərhəd olduğu üçün burada ermənilərin qəlbindəki qara niyyət özünü daha tez biruzə verməyə başladı. Doğma kəndin tez-tez atəşə tutulması, günahsız dinc sakinlərin həlak olması digərləri kimi Səfəri də bu mübarizəyə qoşulmağa vadar etdi. Döyüş yoldaşlarının şəhid olması ermənilərə qarşı nifrəti daha da artırırdı. Hamı kimi Səfər də bu yolun ölümlü-itimli olduğunu dərk edirdi. Lakin ermənilərə qarşı nifrət hissi, digərləri kimi, onu da bu yoldan döndərə bilmədi. 1992-ci il dekabr ayının 31-i idi. Həmin gün hamı bu xəbəri eşitdi: “Qəşəmov Səfər Əmiraslan oğlu şəhid olmuşdu”. Əlbəttə o ölməmişdir, şəhid olmuşdur! Bu adı özündə daşıyan hər kəs xoşbəxtdir. Ölümündən sonra olsa belə. Biz şəhidlərimizlə həmişə

fəxr edəcəyik. Onların ruhu qarşısında baş əyirik. Allah onlara rəhmət eləsin!

# Quliyev Anar Hüseyin oğlu



Anar 1974-cü ildə Gədəbəy rayonunun Zamanlı kəndində anadan olmuşdu. 1991-ci ildə orta məktəbi fərqlənmə ilə qurtarmışdı. Vətən igid oğullarını köməyə səsləyirdi. Qəti qərara gəlmişdi Anar. Döyüşən orduya gedəcəyini söyləmişdi. Yoldaşları ona məsləhət verəndə ki:
– Orta məktəbi əla qiymətlərlə bitirmisən, istədiyin ali məktəbə girə bilərsən.Anar onların sözünü yarımçıq kəsib: – Ali təhsil almaq həmişə olar. Amma bu gün Vətənin ağır günüdür. Mən onun köməyinə getməliyəm, – demişdi. Anar tez-tez Şınıxdakı ordu hissələrinə baş çəkir, əskərlərlə dostlaşırdı. Hərbçilər də ona texnikanın sirlərini, silahlardan atəş açmağı öyrədirdilər. 1993-cü il noyabrın doqquzunda Anar ordu sıralarına yola düşdü. Valideynləri yaxşı yol, uğurlu xidmət arzuladılar övladlarına. Bir müddət Salyan rayonunda xidmət etdi. İntizamlı olması ilə yoldaşlarından fərqlənən Anarı prezident qvardiyasına qəbul etdilər. Lakin rahat həyat onu qane etmirdi. Ko-mandanlıqdan dəfələrlə xahiş etmişdi ki, onu qaynar nöqtələrə göndərsinlər. Nəhayət, istəyinə nail olur. Ağdərə əməliyyatında (Vəzirin dəstəsində) iştirak edir. Qəhrəmanlıqla döyüşür. Qazanılmış qələbədə Anarın da böyük xidmətləri olur. Komandir bir neçə günlüyə ona evə getməyə icazə verir. Gəncəyə xalasıgilə gəlir. Xalası Anarın onlarda qalıb “Novruz bayramı”nı birgə keçirməyini xahiş edir. Anar razılıq vermir. Xalasına deyir:
– Xocalı faciəsinin əvəzini çıxmaq lazımdır. Bizim rahat oturub bayram etməyə, sevinməyə haqqımız yoxdur. Mən axşam döyüş xəttinə qayıtmalıyam, yoldaşlarımı səngərdə qoyub bayram edə bilmərəm.
Anar hissəyə qayıdır. Komandirləri tez qayıtmağının səbəbini soruşanda:
– Allah qoysa, bayramı birlikdə edərik, – deyir. ... 23 mart 1993-cü il. Çıldıran uğrunda ağır döyüşlər gedirdi. Erməni ordusu strateji

mövqeyi əldən verməmək üçün əllərindən gələni edirdi. Azərbaycan ordusunun əskərləri də qəhrəmanlıqla döyüşürdülər. Tədricən üstünlük ordumuzun tərəfinə keçirdi. Hücumda dönüş yaranmışdı. Anar və yoldaşları qələbənin tezliklə qazanılacağına əmin idilər. … Düşmən tərəfdən açılan atəş Anarı başından yaraladı. Yaralı qartalın qolları boşalıb avtomatı əlindən düşdü. Yoldaşları tez köməyə gəldilər. İlk tibbi kömək göstərdikdən sonra Anarı Bakıya neyrocərrahiyyə institutuna gətirdilər. Həkim Hümbətovun dediklərindən:

– Anarın yarası çox ağır idi. Beyninin üçdə bir hissəsin-də həyat əlamətləri pozulmuş, bədənində 50 qəlpə var idi. Anar bircə dəfə də “of” demədi. Gülərüz oğlan idi. Hər dəfə soruşanda ki, “necəsən”, “yaxşıyam” deyərdi.

Yetmiş gün Anar müalicə olundu. Valideynləri, qohumları, dostları onun ağır yaralara necə mətanətlə dözdüyünü gördülər. Ata-ana yaralı oğullarına həyan oldular. Ağır, uzun gecələri onun çarpayısı yanında keçirdilər. Ümidlərini üzmədilər. Amma 1993-cü ilin 25 may səhəri Anar yüksəklikdə sönən ulduz kimi söndü. Heysiz dodaqlarından ana-ana gəlməsi güclə eşidildi. Ömrünə-gününə qaranlıq çökdü Anarın. Canından əziz tutduğu dağlara, Zamanlı kəndinə ağrılı-acılı xəbəri döndü. Oğul deyib ağlayan ananın bala məhəbbəti ilə qovrulan qəlbinin sızıltıları yeri-göyü ağlatdı. … Yox, Anar, sən ölməmisən, şəhid olmusan. Şəhidlər isə həmişə qəlblərdə yaşayır, ruhu el-el dolaşır. Rahat uyu, dağlar oğlu. Silahdaşların körpələrimizi qanına boyayan, evlərimizi xaraba qoyan, kəndlərimizi yandıran canilərdən intiqamımızı alacaqlar.

# Quliyev Elxan Əzim oğlu



Quliyev Elxan Əzim oğlu 1971-ci ildə Gədəbəy rayonuun Arıqıran kəndində anadan olmuşdur. 1989-91-ci illərdə sovet ordusunda xidmət edib. 1992-ci il avqust ayından Azərbaycan milli ordusuna Gədəbəy RHK-dan çağırılıb. Ağdam rayonunda daxili qoşunların 3651 № li briqadasında xidmətə başlamışdır. Ağdam bölgəsində bir çox döyüşlərdə iştirak

etmiş və 1993-cü ildə yaralanıb. Müalicə olunandan sonra 1993-cü il noyabr ayında 702 №-H hərbi hissədə xidmətə başlamış və Füzuli rayonunun Əhmədbəyli, Bəy Bəhmənli, Araz Yağlavəndi, Babı, Arayatlı, Şükürbəyli, Aşağı Abdulrəhmanlı, Aşağı Seyidəhmədli, Yuxarı Seyidəhmədli, Alxanlı kəndlərinin azad edilməsi uğrundakı döyüşlərdə iştirak etmişdir. Hərbi hissəyə gəldiyi ilk gündən özünü bacarıqlı döyüşçü, intizamlı əsgər kimi tanıtmış, döyüş yoldaşlarının komandir və rəislərin əmr və tapşırıqlarının vaxtında yerinə yetirilməsi üçün daim çalışmışdır. Mülayim və səmimi münasibətinə görə həmişə döyüş yoldaşları tərəfindən sevilmiş və hörmət olunmuşdur. 31 oktyabr 1994-cü ildə Füzuli rayonunun Alxanlı kəndində xidməti vəzifəsini yerinə yetirərkən minaya düşüb şəhid olmuşdur.

# Quliyev Maqsud İbad oğlu



Quliyev Maqsud İbad oğlu 1976-cı ildə Gədəbəy rayonunuda Hacılar sovetliyinin Qaravəlilər kəndində anadan olmuşdur. 1993-cü ildə onbirillik orta məktəbi bitirib. 1995-ci il 15 iyulda həqiqi hərbi xidmətə gedib. 1997-ci ildə Füzuli rayonundakı 704 saylı hərbi hissədə xidməti vəzifəsini yerinə yetirərkən qəza nəticəsində həlak olmuşdur.

# Quliyev Mayıl Zaman oğlu



Quliyev Mayıl Zaman oğlu 1975-ci ildə Gədəbəy rayonunun Ağamalı kəndində kolxozçu ailəsində anadan olmuşdur. 1982-ci ildə Ağamalı kənd orta məktəbinə daxil olub, 1992-ci ildə həmin məktəbin onuncu sinfini bitirmişdir. 1992-ci ilin may ayında Gədəbəy rayon hərbi komissarlığından hərbi xidmətə çağırılmış və Biləcəri hərbi çağırış məntəqəsindən birbaşa Ağdam döyüş bölgəsinə göndərilmişdir. 20 aprel 1993-cü ildə Ağdam rayonunun Mərzili kəndi uğrunda gedən döyüşlərdə itgin düşmüşdür.

# Quliyev Rauf Əhəd oğlu



Quliyev Rauf Əhəd oğlu 1973-cü ildə Gədəbəy rayonunun İnəkboğan kəndində anadan olub. 1979-cu ildə İnəkboğan kənd orta məktəbinə daxil olmuş, 1989-cu ildə orta məktəbi bitirmişdir. 1991-ci ildə hərbi xidmətə getmiş, Şınıx bölgəsində zenit qurğularında, yəni hava qüvvələrindən müdafiə bölgəsində, hərbi xidmətini davam etdirmişdir. 1993-cü ilin iyun ayında Ağdam uğrunda gedən döyüşlərdə yaxından iştirak etmişdir. 1993-cü ilin avqust, sentyabr aylarında yenidən öz doğma torpağını müdafiə etmək üçün Gədəbəyin Şınıx bölgəsinə qayıdıb, orada bir müddət qulluq etdikdən sonra 1994-cü ilin yanvarın 25-də Kəlbəcər bölgəsinə gedib. Orada döyüşlərdə iştirak edib. Kəlbəcər rayonuna iki kənd qalmış döyüşlərdə qəflətən ermənilərin güclü hücumu nəticəsində komandirlərin əmri ilə “geri çəkilmək lazımdır” O əmrini almışdır. Rauf Quliyev Yardımlı rayonunudan olan leytenant Elman adlı bir nəfər komandiri ağır xəstə olduğu üçün buraxmamış, onu özü ilə gətirmişdi. Kəlbəcər rayonunun Güzgü dağında 48 nəfər olublar. Onlar belə məsləhətləşiblər ki, 24 nəfər bir dəstə qabağda, ikinci dəstə arxada getsin. Bu vaxt ermənilərin atəşi nəticəsində yolda tar yeriyib, komandirlə birlikdə qabaqda gedən dəstə tara düşüb. Gecə imiş. Onlar yoldaşlarnı və komandirlərini tardan çıxarmağa cəhd göstəriblər. Lakin bu vaxt Rauf Quliyev gecə olduğuna görə qəflətən qayadan düşüb. Buna baxmayaraq o, çalışır yoldaşlarını xilas etsin, ancaq səhər açılanda görür ki, onları xilas etmək qeyri mümkündü.

Qayadan düşdüyünə görə onun ağrıları şiddətlənir, hərəkət edə bilmir. Həmkəndlisi Yusifov Tofiqlə həmin yerdə rastlaşır. Quliyev Raufun yoldaşları Tofiqlə məsləhətləşirlər ki, onun yanında gözləsin, ştaba xəbər çatdıracaqlar. Bir azdan sonra Rauf Tofiqlə məsləhət edib ki, o özü gedib ştabdan kömək gətirsin. Tofiq Toğana kəndinin axırıncı postundan kömək göstərdikdə Raufu dünyasını dəyişmiş vəziyyətdə görüb.

## Quliyev Rizvan Vaqif oğlu



Quliyev Rizvan Vaqif oğlu 1972-ci ildə Gədəbəyin Əlismayıl kəndində anadan olmuşdur. Doğma kənddə orta məktəbi bitirdikdən sonra 1990-cı ildə hərbi xidmətə çağırılır. Sumqayıtda, Nasosnı deyilən yerdə hərbi xidmətini başa vurur. 1992-ci ildə geri qayıdır. Hərbi xidmətini sona yetirsə də düşmənə olan sonsuz intiqamı onu döyüşə səsləyir. 1994-cü ildə yenidən orduya səfərbər olunur Rizvan. Bu dəfə Tərtər istiqamətində gedən döyüşlərdə fərqlənir.1994-cü il aprelin 30-da Tərtər uğrunda gedən döyüşlərdə həlak olub şəhidlik zirvəsinə yüksəlir. Bu dünyada 22 bahar yaşadı Rizvan. Amma bu kiçik ömür gələcək nəsillər üçün torpağa, Vətənə məhəbbət nümunəsi, örnək ola biləcək qədər mənalı və qiymətlidir.

## Quliyev Vəli İbrahim oğlu



**Q**uliyev Vəli İbrahim oğlu 1968-ci ildə Gədəbəy rayonunun Heriknaz kəndində anadan olmuş, həmin kənddə boya-başa çatmışdır. Könüllü olaraq Sumqayıt şəhərindən hərbi xidmətə yola düşüb. Qarabağ bölgəsində düşmənə qarşı vuruşub, 1992-ci

ildə Ağdərə bölgəsində gedən döyüşlərdə qəhrəmancasma həlak olmuşdur.

## Qurbanov Əkbər Məmməd oğlu



Qurbanov Əkbər Məmməd oğlu 1947-ci ildə Gədəbəy rayonunun İsalı kəndində anadan olmuşdur. Orta məktəbi İsalı kəndində bitirdikdən sonra, Bakı şəhərində 8 saylı tibb texnikomuna sənədlərini verib. 1966-ci ildə həmin texnikoma daxil olur. Bir il oxuduqdan sonra hərbi xidmətə çağırılır. Bakı şəhərində yerləşən keçmiş "Salyanski kazarma" adlanan hərbi hissəyə tibb işçisi kimi xidmətə göndəri-lir. Yaxşı xidmət etdiyinə görə ona "serjant" rütbəsi verilir. 1968-ci ildə hərbi xidməti başa vurduqdan sonra, hərbi hissədə tibb işçisi kimi qalması xahiş olunur. Ancaq hər şeydən əziz olan el-oba həsrəti onu yenə də doğma kəndinə qaytarır. 1969-cu ildə təhsilini başa vurub, İsalı kənd xəstəxanasında işə götürülür. 3 il öz kəndində tibb işçisi kimi fəaliyyət göstərir. 1972-ci ildə İsalı kənd rabitə şöbəsinə rəis təyin olunur. Həmin vaxtdan yaxşı işçi kimi fəaliyyət göstərdiyinə görə ona dəfələrlə rayon rəhbərliyi tərəfindən mükafatlar verilmişdir. Nəhayət 1988-ci ildən başlayan erməni münaqişəsi Şınıx zonasından yan keçmir. Rayon mərkəzindən 60-70 km məsafədə yerləşən İsalı kəndinin əhalisinin rayona getməsi üçün "Başkənd" ərazisindən keçməsi hər cür qorxu və təhlükə ilə qarşılaşırdı. Ermənilər dəfələrlə bu yolda maşınların qarşısın kəsir, hədə-qorxu gəlir, insanları qətlə yetirirdilər. Belə faciələrdən biri 1990-cı il yanvar ayının 30-da baş vermişdir. Belə ki, Qurbanov Əkbər 4 nəfər rabitə işçisi ilə birlikdə öz maşınında rayon mərkəzinə yola düşür. Təqaüdçülərin pulunu bankdan alıb kəndə qayıdarkən Novosaratovka kəndində daha 2 nəfər həmkəndlilərini də öz maşınına götürür. Şaxtalı yanvar gecəsində hər cür müasir silahla təchiz olunmuş erməni quldurlarından ibarət bir qrup həmin gün Köhnə Başkənd kəndində pusquda durublarmış. Maşını hər tərəfdən atəşə tutaraq, 2 nəfəri – Əsgər Cəlilovu, Məhər Vəliyevi dərhal qətlə

yetirib, dörd nəfəri girov götürüblər. Onların aqibətlərindən bu günə qədər xəbər yoxdur.
Qurbanov Əkbər Məmməd oğlu ailəli idi. İki oğlu və iki qızı var.

# Mahmudov İntiqam Dilqəm oğlu



Mahmudov İntiqam Dilqəm oğlu 1975-ci ildə Gədəbəy rayonunun Qarıkənd kəndində anadan olub. 1998-ci ildə Qarıkənd səkkizillik məktəbini, 1993-cü ildə Gərgər orta məktəbini bitirib. 1994-cü ildə hərbi xidmətə çağırıhb. Vətənimizin azadlığı uğrunda gedən mübarizədə 222 №-li hərbi hissənin tərkibində işğalçı erməni ordusuna qarşı aparılan bir neçə ağır döyüşlərdə mərdliklə vuruşub. İştirak etdiyi döyüşlərdə bir dəfə də olsun düşmən önün-dən qaçmayıb. Vətən torpağına sevgisi İntiqamı həmişə irəliyə düşmən üzərində qələbəyə aparırdı. 1994-cü il martın 22-də Füzuli rayonunun Alxanlı kəndində gedən ağır döyüşdə aldığı yaralar İntiqamın ömrünə son qoydu. Həyatını təzəcə çiçəklədiyi bir vaxtda Vətəninin, xalqının yolunda qurban verdi. 1994-cü ildə martın 25-də “Şəhidlər xiyabanı”nda dəfn edildi. Bu gün, bitirmiş olduğu Gərgər kənd orta məktəbi İntiqam Dilqam oğlunun adını daşıyır.

# Məhəmmədov Əkbər Allahverdi oğlu



Məhəmmədov Əkbər Allahverdi oğlu 1977-ci ildə Gədəbəy rayonunun Rüstəm Əliyev kəndində anadan olmuşdur. 1996-cı ildə həmin kəndin 2 saylı orta məktəbini bitirmişdir. 1997-ci il avqustun 2-də orduya çağırılıb. Bir neçə döyüşdə iştirak etdikdən sonra Tovuz rayonunun Əlibəyli kəndində 8 iyun 1997-ci ildə şəhid olmuşdur. R. Əliyev kənd qəbiristanlığında dəfn olunmuşdur.

## Məhərrəmov Rövşən Rəhim oğlu



Məhərrəmov Rövşən Rəhim oğlu 1 dekabr 1973-cü ildə doğulub, 1980-cı ildə Mormor kənd natamam orta məktə-binin birinci sinfinə gedib. 1989-cu ildə məktəbi qurtarıb. 1993-cü ildə Gədəbəy çörək qənnadı müəssisəsində anbarda fəhlə işləyib. 1994-cü ildə hərbi xidmətə gedib. 1995-ci ildə Tərtər rayonunun Cəmilli kəndində şəhid olub. Ailə qurmamışdı.

## Məhərrəmov Tahir Qəhrəman oğlu



Məhərrəmov Tahir Qəhrəman oğlu 1966-cı ildə Gədəbəy rayonunun Parakənd kəndində anadan olub. Ailələri Mingəçevir şəhərinə köçmüşdür. Mingəçevir şəhərindən 1992-ci ildə könüllü olaraq orduya getmişdi. Onun döyüş yolu Füzulidən başlanıb. Döyüşdə yaralanmış, müalicə aldıqdan sonra yenidən döyüşlərə qatılmışdır. Bu dəfə onun döyüş yolu Tərtər rayonundan başlanır. Tərtər rayonunun Marquşavan kəndində gedən döyüşlərdə qəhrəmancasına həlak olur. Evli idi. Bir oğlu var.

## Məmmədov Allahverdi Famil oğlu



Çay Rəsullu kəndində doğulmuşdur. Ermənilərin atdığı top mərmisi evi uçurmuş, Allahverdini, anasını və bacısını öldürmüşdür.

## Məmmədova Sinəxan Cabbar qızı



Ermənilərin atdığı top mərmisi evi uçurmuş Sinəxanı, oğlunu və qızını məhv etmişdir.

ARAYIŞ

Verilir Çay Rəsullu kənd sakinləri mərhum:
1. Məmmədova Sinaxan Cabbar qızı 1934-cü ildə anadan olmuşdur.
2. Oğlu Məmmədov Allahverdi Famil oğlu 1965-ci ildə anadan olmuşdur.
3. Qızı Məmmədova Əsmayə Famil qızı 12.09.1979-cu il-də anadan olmuşdur.
Hər üçü 3 avqust 1992-ci ildə ermənilər tərəfindən atılmış top mərmisi nəticəsində evləri dağılmış və həlak olmuşlar.

# Məmmədov Aytəkin İsrayıl oğlu



Məmmədov Aytəkin İsrayıl oğlu 1968-cı ildə Gədəbəy rayonunun Göyəlli kəndində anadan olmuşdur. Aytəkin Məmmədov 1974-cü ildə Göyəlli kənd orta məktəbinin birinci sinfinə daxil olmuşdur. Həmin məktəbi 1984-cü ildə bitirib. Aytəkin Məmmədov məktəbi bitirdikdən sonra hərbi xidmətə çağırılıb. O, Əfqanıstanda hərbi xidmətini başa vurub. Sonra ərazimizin bütövlüyü uğrunda gedən döyüşlər-də könüllü iştirak etmişdir. 1991-ci ildə Çaykənd əməliyyatı zamanı şəhid olmuş və ölümündən sonra Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür. Subay idi.

# Məmmədov Bayram Həsən oğlu



Məmmədov Bayram Həsən oğlu 1958-ci ildə Arıqıran kəndində anadan olmuşdur. 1976-cı ildə orta məktəbi qur-tarıb. 1977-ci ildə Sovet ordusuna gedib. Sürücülük kursu-nu bitirib. 1983-cü ildə Saratovda yaşayıb. 1988-ci ildə Bakıya qayıdıb. Suraxanı rayonunun Hövsan qəsəbəsində yerləşmişdi.1993-cü il 18 martda Azərbaycan ordusuna daxil olub. 1994-cü il 10 yanvarda şəhid olub. Hövsanda könüllü

ordunun yaranmasında iştirak edib və təşkilatçı olub. Füzuli bölgəsində fəal iştirak edib və zirehli maşında müəyyən igidlik göstərib. İki övladı var. Ananın sözü: “Rusiyadan öz qardaşını götürüb doğma Vətəninə kömək üçün qayıtdı. O, hər televiziya verilişlərinə baxarkən torpağımıza erməni quldurunun vəhşicəsinə soxulmasına, qoca və cavanların əsir aparılmasına bir an da dözmürdü. Həmişə mənə deyirdi: “Vətəni və ana-bacıları qorumaq bizim borcumuzdur.” Onun bir qardaşı Məmmədov Mehman Ağdam bölgəsində arteleriya dəstəsində vuruşurdu. Mən ona deyirdim: “-Sənin yaşın daha ötüb (yəni 35 yaş). Sənin qardaşın döyüşür.” O, mənə deyirdi: “- Qardaşın çox gəncdi, Vətənə köməyi dəyməz. Mən özüm get-məliyəm.” Axırda məndən xəbərsiz getdi və həlak oldu.

# Məmmədov Elşən İsmayıl oğlu



Məmmədov Elşən İsmayıl oğlu 16 may 1973-cü ildə Gədəbəy rayonunun Xarxar kəndində anadan olub.1980-cı ildə Xarxar kənd orta məktəbinin birinci sinfinə ge-dib, 1990-cı ildə həmin məktəbin onuncu sinfini bitirmişdir. 5 may 1992-ci ildə hərbi çağırışla əlaqədar Gədəbəy ra-yon hərbi komissarlığı tərəfindən hərbi xidmətə çağırılmışdır. Həmin tarixdən hərbi xidmətini Gədəbəy rayon Şmıx bölgəsində başlamışdır. 24 sentyabr 1992-ci ildə hərbi borcunu yerinə yetirdiyi zaman Şınığm qoynunda qəhrəmancasına həlak olmuşdur.

# Məmmədov Cəmil Ziyadxan oğlu



Məmmədov Cəmil Ziyadxan oğlu 1975-ci ildə Gədəbəy rayonunun Ağamalı kəndində kolxozçu ailəsində anadan olmuşdur. 1982-ci ildə Ağamalı kənd orta məktəbinin birinci sinfinə daxil olub, 1992-ci ildə həmin məktəbin onuncu sinfini bitirmişdir. 1993-cü ilin may ayında Gədəbəy rayonu hərbi komissarlığından hərbi xidmətə çağırılmış və birbaşa Füzuli bölgəsinə cəbhəyə göndərilmişdir. 15.02.1994-cü il tarixdə 172 saylı hərbi hissənin tərkibində Kəlbəcər rayonu uğrunda gedən döyüşlərdə şəhid olmuşdur.

# Məmmədova Əsmayə Famil qızı

1979-1992

Ermənilərin atdığı top mərmisi evlərini uçurmuş, Əsmayənin, Əsmayənin anası Sinəxanım və 3 qardaşı – Cabbar, Allahverdi və Familin ömrünə son qoymuşdur.

# Məmmədov Fikrət Bayram oğlu



Məmmədov Fikrət Bayram oğlu 7 aprel 1965-ci ildə Gədəbəy rayonunun Düzyurd kəndində anadan olmuşdur. O, 1972-ci ildə Düzyurd kənd orta məktəbinə getmiş, 1982-ci ildə həmin məktəbi bitirmişdir. 1983-cu ildə hərbi xidmətə çağırılmış və 1985-ci ildə hərbi borcunu yerinə yetirib, evlərinə qayıtmışdır. 1 iyun 1987-ci ildə 332 №-li peşə mək-təbində oxumuşdur. Gizir Məmmədov Fikrət Bayram oğlu Azərbaycan Respublikası Silahlı Qüvvələrində 29 sentyabr 1992-ci il tarixdən xidmət edib. Ağdərə rayonunda gedən döyüşlərdə 1992-ci il dekabrın 20-də həlak olmuşdur. Düzyurd kənd orta məktəbinə onun adı verilmişdir.

## Məmmədov Oqtay İbrahim oğlu



Məmmədov Oqtay İbrahim oğlu 1965-ci ildə Gədəbəy rayonunun Novoivanovka kəndində anadan olmuşdur. 1972-ci ildə Novoivanovka kənd orta məktəbinin birinci sinfində oxumuş və 1982-ci ildə həmin məktəbi qurtarmışdır. 1983-cü ildə hərbi xidmətə çağırılmış və 1985-ci ildə xidməti başa vuraraq Novoivanovka kəndinə qaytmışdı. 1992-ci ilin mart ayının 16-da Gədəbəy rayonunun Novoivanovka kəndində yaradılmış özünümüdafiə dəstəsinə daxil olmuşdur. O, Çiçəkli yüksəkliyində ilk dəfə erməni quldurları ilə baş verən döyüşdə iştirak etmişdir. Məmmədov Oqtay İbrahim oğlu 1992-ci ilin sentyabr aynın 20-də 2 nəfər yoldaşı ilə Pereval yüksəkliyinə qalxarkən mina qəlpəsindən həlak olmuşdur.

## Məmmədov Sabir Mikayıl oğlu



Məmmədov Sabir Mikayıl oğlu 29 dekabr 1966-cı il tarixdə Gədəbəy rayonunun Şınıx kəndində anadan olmuşdur. 1974-cü ildə Şmıx kənd orta məktəbinin birinci sinfinə ge-dib, 1984-cü ildə həmin məktəbin 10-cu sinifini bitirmiş-dir. 1985-ci ildə ordu sıralarına getmiş, 1987-ci ildə xidmətini başa vurmuşdur.7 iyul 1987-ci ildə Azsantexhemoquraşdırma YQB-nin Bakı Şənaye quraşdırma idarəsində III dərəcəli cilingər işləmişdir. 1 mart 1994-cü il tarixdə Bakı şəhəri Nizami rayon hərbi komissarlığı tərəfindən könüllülər sırasmda Azərbaycan Respublikasmm müdafiəsi üçün yenidən hərbi xidmətə cəlb edilmişdir.

O, Füzuli rayonun Böyük Bəhmanlı, Kiçik Bəhmanlı kəndlərində, Tərtər rayonunun müdafiəsində, sonra isə Gədəbəy rayonunun ərazisində gedən bütün döyüşlərdə iştirak etmişdir. 17 iyul 1994-cü

il tarixdə İvanovka ərazisində ge-dən döyüşlərdə həlak olmuşdur. Subay idi.

## Məmmədov Seymur Həsən oğlu



Məmmədov Seymur Həsən oğlu 1982-ci ildə Gədəbəy rayonunun Əlismayıl kəndində anadan olmuşdur. 2000-ci ildə Əlismayıl kənd orta məktəbini qurtarıb. 2000-ci ilin oktyabr ayında hərbi xidmətə yola düşən Seymur, Naxçıvan bölgəsində torpaqlarımızın keşiyində ayıq-sayıq dayanmışdır. 15 may 2001-ci il tarixdə “Şəda” döyüş bölgəsində mina partlayışı nəticəsində şəhid olmuşdur. Seymurun xatirəsi doğma kəndinin adamlarının və əsgər yoldaşlarının qəlbində həmişə yaşayacaqdır. Allah rəhmət eləsin!

## Məmmədov Şaiq Vilayət oğlu

Məmmədov Şaiq Vilayət oğlu 1967-ci ildə Gədəbəy rayonunun Zamanlı kəndində anadan olmuşdur. 1975-ci ildə Gədəbəy rayonu Zamanlı kənd orta məktəbinin birinci sinfinə getmişdir. 1985-ci ildə həmin məktəbin onuncu sinfini əla qiymətlərlə bitirərək, həmin ildə Ukraynanın Dnepropetrovsk şəhərində Metallurgiya institutunun birinci kursuna daxil olmuşdur. Həmin institutu bitirib təhsil aldığı şəhərdə işləyirdi. 1991-ci ildə Xocalı faciəsi Məmmədov Şaiqin də bütün rahatlığını alt-üst etdi. O, könüllü olaraq Azərbaycan ordusu sıralarında erməni quldurlarına qarşı döyüşməyə başladı. Bir neçə döyüş yolu keçdikdən sonra Azərbaycan xalqının igid oğlu Məmmədov Şaiq Vilayət oğlu Ağdam rayonu Xramurd uğrunda gedən döyüşlərin birində 1992-ci ildə qəhrəmanlıqla şəhid olmuşdu.

* *

Başı qarlı, sinəsi çarpaz, əzəmətli Şınıx dağları... Kimlər böyüdü, kimlər uyudu sizin qucağınızda. İgidlərin and içdilər torpağına, daşına. Yağı düşməni torpaqlarına qoymayacaqlarına, anaların ağ saçlarına, Vətənin bayrağına, Azərbaycana vurulan yaraların intiqamını alacaqlarına and içdilər. Gədəbəyin, Şınıxın dağ vüqarlı igid oğulları... Onlardan biri də Şaiq Məmmədov idi.
Şaiq 1967-ci il dekabr ayının 23-də Gədəbəy rayonunun Zaman kəndində anadan olmuşdu. Ailənin yeddinci uşağı idi. Hələ uşaqlıqdan ona həsəd aparırdılar. Qoçaq, cəsarətli, haqqı nahaqqa verməyən, qeyri-adi qüvvəyə malik oğlan idi Şaiq. Özündən yaşca böyük uşaqların kürəyini bircə göz qır-pımında yerə vururdu. "Allah vergisidir" deyirdilər qonşular Şaiqin gücünə.
Şaiq dağları çox sevirdi. Elə bağlanmışdı bu dağların mehrinə, ülfətinə. Bircə gün dözə bilmirdi ağ örpəkli qayaların həsrətinə. İllər ötdükcə Şaiq böyüdü. Boylubuxunlu bir oğlan oldu. Sevildi. Xoş arzularla yaşadı...
Orta təhsilini başa vurduqdan sonra Şaiq Bakıya gəlir. Sənədlərini Dnepropetrovsk Metallurgiya institutuna təqdim edir. Dnepropetrovsk ali məktəbi Azərbaycan üçün cəmi bir yer ayırıbmış. Sənəd götürənlər Şaiqə deyirlər ki, bura girmək hər oğulun işi deyil. Başına indidən çarə qıl. Şaiq üzünü onlara tutub deyir: – Elə o bir yerə mən qəbul olacağam.
Özünə inanırdı Şaiq. Bu inama da əsas var idi. Səfail Ələskərov, Fərhad Vəliyev, Əli Bayramov və Tofiq Bayramov kimi istedadlı müəllimlərdən dərs almışdı. Elmin sirlərinə bələd olmuşdu. Birinci imtahandan əla qiymət alan Şaiq arzusuna çatır. Dnepropetrovsk metallurgiya institutuna qəbul olunur. Bu xəbəri eşidən ata-ananın sevinci yerə-göyə sığmır. Beşillik təhsil illəri, qürbət ellər Şaiqi qətiyyən qorxutmur. İnstitutda sayılıb-seçilən tələbələrdən olur. Müəllimləri onu başqalarına həmişə nümunə göstərir. Tələbə yoldaşı Sveta ilə ailə həyatı qurur. 1992-ci il fevralın 20-də oğlu dünyaya gəlir. Adını Ruslan qoyurlar. Şaiq institutu bitirib kamil bir mütəxəssis olmaqla yanaşı, həm də övladını, ailəsini sonsuz dərəcədə sevirdi...

... Azərbaycanda isə ağır müharibə gedirdi. Xocalı faciəsi Şaiqin qəlbinə dağ çəkmişdi. Fikirdən gecələr oyaq qalırdı. Mərhum Çingiz Mustafayevin çəkdiyi yeganə videokaset Dnepropetrovsk şəhərində Şaiq Məmmədovun rəhbərlik etdiyi "Azərbaycan cəmiyyəti"nin üzvlərinin güclü səyi və çalışqanhğı nəticəsində bütün Ukraynaya paylanmış və nümayiş etdirilmişdi. Bu videokasetə ilk dəfə tələbə

yataqxanasında azərbaycanlı tələbələrlə birlikdə baxan Şaiq son dərəcə sarsılıb. Həyat yoldaşı Svetanın dediklərinə görə, xeyli vaxt özünə gələ bilməmişdi. Azərbaycanın dərdinə biganə qala bilməyən Şaiq sərhəd zonasında yaşayan ata-anasını yoxlamağa getmək adı ilə qırx günlük uşağını qundaqda qoyub, həyat yoldaşı Svetaya bir həftəyə geri dönəcəyini deyib doğma kəndinə – Zamanlıya yola düşmüşdü. Kənddə bir neçə gün ata-anasına kömək edir. Sonra qonşu kəndlə həmsərhəd olan Krasnoselsk rayonuna "gizli səfərə" çıxıb, düşmənin 1 ədəd PDM-ni gətirib Göyəlli kən-dində mövqedə duran əsgərlərə təhvil verir. Əskərlərə PDM-i idarə etməyi də öyrədir.Ön cəbhəyə yola düşməyi qərara alır. Kəndi tərk etməmişdən əvvəl mərhum Anar Quliyevlə qucağında böyüyüb boy atdığı dağlara çıxmış, özünün çox xoşladığı aşıq mahnısını zümzümə etmişdi: Bəlkə bir də bu yerlərə dönə bilmədim, Duman, salamat qal, dağ, salamat qal!
Beləcə, dağlarla sonuncu dəfə vidalaşır. Şaiq aprel ayının 10-da Bakıya qayıdır. "Şəhidlər xiyabanı"nı ziyarət edərkən növbəti şəhidi dəfn edən döyüşçülərlə dərdləşir və onların Qarabağın "Şahinlər dəstəsi" adı altında vuruşduqlarını öyrənir. Dəfndə iştirak edən dəstənin rəhbəri ilə görüşür və onu dəstəyə qəbul etmələrini xahiş edir. Komandir razılıq verir. Ayın 12-də Şaiq qardaşına deyir ki, Dnepropetrovska qayıdacaq. Elə həmin gün Şaiq Qa-rabağa, cəbhəyə yola düşür. Aprel ayının 14-də Şaiq Məmmədov artıq "Şahinlər dəstəsi"ndə vuruşan zabit idi. İndi o özünü Vətənin əsl layiqli oğlu kimi hiss edirdi. Cəmi 12 gün döyüşmək qismət oldu Koroğlu kürəkli, Fərhad biləkli igidimizə. Aprel ayının 26-sı idi. Şaiq mövqedə durmaq üçün komandirdən icazə istədi. Komandir dedi ki, axı onun növbəsi deyil. Şaiq təkid etdi. Elə həmin gecə şiddətli döyüşlər başladı. Şaiq düşmən snayperlərini susdurmaq üçün ayağa qalxdı. Komandirin verdiyi əmrləri belə eşitmədən irəliləyirdi. Qəflətən düşmən projektorları Şaiqin üzərinə yönəldildi. Düşmən igid zabitin ürəyini nişan almışdı. Dalbadal açılan atəş Şaiqin sinəsini yaraladı. Şaiq torpağa sərildi. Köksü qızıl qana boyandı dağlar oğlunun. Xramort kəndi uğrunda döyüşdə qəhrəmanlıqla həlak oldu igid el-oğlumuz. Dörd saatdan sonra yoldaşları Şaiqin meyitini döyüş meydanından çıxarıb doğma kəndinə göndərdilər. Atılan güllənin biri onun cibində olan hərbi biletinin şəklini deşərək ürəyinə dəymiş, ikincisi sol yanağından dəyib qulağının dibindən çıxmışdı. Ölümündən dörd gün qabaq Şaiq cib dəftərində belə bir qeyd etmişdi: "Qarabağ". "Şahinlər dəstəsi". "Həyat alovdan doğur". Ağdam. Xramort kəndi. 22. IV. 1992-ci il. Şaiqin yas məclisinə bütün

Şınıx gəlmişdi. Göylər də, dağlar da Şaiq adlı bir igidi ağlayırdı. Mən də bu dağların nəsinə gəldim, Mələşir quzular, səsinə gəldim, Burda igid ölüb, yasına gəldim, Sən də bizim kimi ağla, a dağlar. Görəsən Şaiq bu nəğməni də bilirdimi? Vətənə, torpağa olan məhəbbət Şaiq üçün hər şeydən – ata-anaya, bacı-qardaşa, həyat yoldaşına, qırx günlük yeganə yadigarı olan oğluna və nəhayət, insana tək bircə dəfə verilən həyatda olan məhəbbətdən də üstün imiş. Bunu Şaiq fəth etdiyi şəhidlik zirvəsi ilə sübut etdi. Bu torpaq durduqca sizin adınız yaşayacaq, hər kəs sizə təzim edib, baş əyəcək. Yatın canınızdan artıq sevdiyiniz Ana torpağın qoynunda. Allah sizə rəhmət eləsin. Amin!

## Məmmədov Tahir Cəlal oğlu

Məmmədov Tahir Cəlal oğlu 1967-ci ildə Cədəbəy Rayonunun Novoivanovka kəndində anadan olmuşdur. 1974-cü ildə Novoivanovka kənd orta məktəbinin 1-ci sinfinə daxil olmuş, 1984-cü ildə həmin məktəbi bitirmişdir. 1984-cü ildə C.İldırım adına Azərbaycan Politexnik İnstitutunun avtomobil nəqliyyatı fakultəsinə daxil olmuşdur. 1985-87-ci illərdə Sovet ordusu sıralarında hərbi xidmətdə olmuşdur. Avtonəqliyyat fakültəsinin AXC idarə heyəti məclisinin üzvü olmuşdur. Azərbaycan Milli Qvardiyasının rəisi vəzifəsində çalışmışdır. 1993-cü ilin 4 iyununda Gəncə hadisələrində həlak olmuşdur.

## Məmmədov Valeh Müslüm oğlu

Məmmədov Valeh Müslüm oğlu 15 may 1949-cü ildə Gədəbəy rayonunun İnəkboğan kəndində anadan olub. O, orta təhsilini İnəkboğan kənd orta məktəbində almışdır. Ailəli idi 07.09.1992-ci ildə Yavıqlı yaylağında ermənilərə qarşı döyüşdə həlak olmuşdur.

## Məmmədov Yaşar Talıb oğlu



Məmmədov Yaşar Talıb oğlu 5 may 1971-ci ildə Gədəbəy rayonunun Ağamalı kəndində kolxozçu ailəsində anadan olmuşdur. 1978-ci ildə Ağamalı kənd orta məktəbinə daxil olub, 1988-ci ildə onuncu sinfi bitirmişdir. 1989-cu ilin may ayında Gədəbəy rayon hərbi

komissarlığından hərbixidmətə çağırılmışdı, xidmətini Perm vilayətində keçirmiş və orada da xidmət müddətini başa vurmuşdur. 1991-ci ilin may ayından 1992-ci ilin fevralına qədər Ağamalı kəndində valideyinləri ilə birgə yaşamış və 1992-ci ilin fevral ayından Gədəbəy rayon hərbi komissarlığından müharibəyə səfərbərliklə əlaqədar Ağdərə, Daşaltı əməliyyatında iştirak etmiş, Vadauz bölgəsin də gedən döyüşlərdə 26 yanvar 1993-cü ildə həlak olmuşdur.

## Məmmədov Rizvan Cəbrayıl oğlu



Məmmədov Rizvan Cəbrayıl oğlu 1974-cü ildə Gədəbəy rayonunun Qaradağ kəndində anadan olub. Azərbaycan Milli Ordusunun əsgəri idi. O da torpaqlarmızın müdafiəsi uğrunda gedən döyüşlərdə böyük şücaət göstərmişdir. Topçu İsgəndərin rotasında xidmət edirdi. Topçu İsgəndər də onun qolları üstündə əbədiyyətə qovuşdu. İsgəndərin yeri boş qalmadı. Rizvan qəhrəman topçu kimi ad çıxardı. 1994-cü il iyunun 6-da erməni ordusu cəbhənin İvanovka (Gədəbəy) bölgəsindən hücuma keçdi. Rizvan sərrast atəşlə düşmən ordusunu geri oturtdu. Lakin bu Rizvanın son döyüşü idi. O, əsil qəhrəman kimi şəhid oldu.

## Məmmədov Ramil Oqtay oğlu

Məmmədov Ramil Oktay oğlu 1985-ci ildə Gədəbəy rayonunun İnəkboğan kəndində anadan olub. O, 1992-ci ilin sentyabrında 1-ci sinfə gedəcəkdi. Əfsuslar olsun ki, ermənilər tərəfindən atılan qradın mərmisi onu 10.08.1992-ci ildə qətlə yetirdi.

## Məmmədhəsənova Reybə Ədil qızı

Məmmədhəsənova Reybə Ədil qızı 1935-ci ildə İnəkboğan kənd İcra nümayəndəliyinin Köhnəqışlaq kəndində doğulmuşdur. 1954-cü ildə Böyükqaramurad kənd icra nümayəndəliyinin Topular kəndinə ərə gəlmişdi. On bir uşaq anası idi. 19 sentyabr 1992-ci ildə Erməni qəsbkarları tərəfindən şəhid olmuşdur.

## Mirzəliyev Fərhad Məhəmməd oğlu



Mirzəliyev Fərhad Məhəmməd oğlu 1946-cı ildə Gədəbəy rayonunun Fərzalı kəndində anadan olub. Hərbi xidmətini Rusiyada keçirib. 1990-cı il yanvarın 30-da Gədəbəydən evə gələn zaman erməni quldurları tərəfindən qətlə yetirilmişdir. Ailəli idi. 3 qızı, 2 oğlu var.

## Musayev Araz Eldar oğlu



Musayev Araz Eldar oğlu 1972-ci ildə İnəkboğan kəndində anadan olub. İnəkboğan kənd orta məktəbini qurtarıb. Rusiyada bir il əsgəri xidmət edib. Qayıtdıqdan sonra Azərbaycan Respublikasının suverenliyi uğrunda Şmıx bölgəsində gedən döyüşlərdə iştirak edib.

1994-cü il avqustun 19-da şəhid olub. Qasimlı kənd natamam orta məktəb onun adını daşıyır.

# Musayev Əli Səməd oğlu



Musayev Əli Səməd oğlu 1972-ci ildə Gədəbəy rayonunun Söyüdlü kəndində anadan olub. Söyüdlü kənd orta məktəbini bitirib. 30 may 1990-cı ildə hərbi xidmətə gedib. 20 yanvar 1993-cü ildə Ağdərə rayonunun Çıldıran kəndi uğrunda gedən döyüşlərdə şəhid olub.

Yaşasaydı, həmin il mayın 9-da 21 yaşı tamam olacaqdı Əlinin. Amma bü günü görmək, baharın laləzar çağında ad gününü doğmaları arasında qeyd etmək, qoynunda böyüyüb kişiləşdiyi, ərsəyə çatdığı dağların tər bənövşəsini, nərgizini qoxlamaq qismət olmadı ona. 1993-cü ilin soyuq, şaxtalı yanvar günlərinin birində Bəyaz ananın sonbeşiyinin cənazəsi gətirildi Söyüdlü kəndinə. Səməd kişinin isti ata ocağından pərvazlanmış 7 övladının ən kiçiyini – üç qardaşın sonuncusunu kəndin ilk şəhidi kimi qarşıladı qədirbilən el-obası. Heç kəs inanmaq istəmədi bu itkiyə. İllah da ki, Bəyaz ana. Axı ömür-gün yoldaşı Səmədin ölümündən sonra onun ocağının yeganə həyanı, həniri idi Əli. Axı ikiillik əsgəri xidmətini yenicə başa vurub qayıtmışdı anasının yanına – 1992-ci ilin iyununda. Avqustda isə gəlin gətirmişdi anasına. Bu kasıb ailədə xudmani bir məclis qurub sevindirmişdi qohum-əqrabanı, dost-tanışı. Gözaydınlığı almışdı. Bəs bu qəfil acı külək hardan əsdi görən belə? Donub qalmışdı Bəyaz ana da, cəmi bir ayın gəlini olmuş Vəfa da. Onların göz yaşları içində qovrulan, qara kölgəyə dönmüş görkəmlərinə baxmaq dəhşət idi!.. Şəhid Musayev Əli Səməd oğlunun əmisi Bəhram kişi ilə söhbətimiz xeyli çəkdi. “Onun son yadigarıdır” – deyib ci-bindən çıxardığı, düşmən gülləsinin iki küncündən deşib keçdiyi qanlı dəftərçəni, bir neçə sənədi bizə göstərdi. Vəfa xanımın fotosu və Əli ilə birlikdə ayaq

üstə çəkdirdiyi (yəqin ki, toydan sonra çəkilmişdi bu şəkil) qana bulaşmış şəkillər də dəftərçənin arasında idi. Əlinin yazdığı qeydləri, şerləri (bitkin olmasa da bir ürəyin döyüntüsü vardı bu misralarda) həyəcansız oxumaq olmurdu. Qəribə idi ki, ömrünü beləcə gənc ikən başa vuracağını duyurmuş Əli. Bu barədə dəftərçəsinə qeyd də yazmışdı. Elə bundan azacıq sonra da… "N" hərbi hissəsinin qərərgah rəisi E. Şirinovun Gədəbəy rayon İcra hakimiyyətinə yazdığı məktubdan oxuyuruq: "… 20 yanvar 1993-cü ildə Ağdərə bölgəsinin Çıldıran kəndi uğrunda gedən döyüşlərdən birində qəhrəmancasına həlak olmuşdur… ". Məktubun sonunda Əli Musayevin adının əbədiləşməsi tövsiyə olunur. Bu da yarımçıq bir taleyin son akkordları… İndi doğma Söyüdlü kənd orta məktəbi onun adını daşıyır.

Kənd orta məktəbini bitirən kimi keçmiş Sovet ordusu sıralarına çağırılmışdı. İkiillik xidmətdən sonra yenicə işə girib evə qazanc gətirmiş, sentyabrın (1992-ci il) 18-də isə Milli Orduya çağırış almışdı. Onu bu xidmətdən yayındırmaq cəhdlərinə özü mane olmuşdu. Kişi qeyrəti, Vətən təəssübkeşliyi yol verməmişdi buna. "Onda atamın çörəyi haram olar mənə" demişdi. Bir də… axı neçə müddət idi narahat edirdi bu daxili hisslər onu. Elə buna görə də silaha sarıldı. Laçın dağlarına üz tutdu, vicdanla döyüşdü. Amma Laçının taleyinə qara xətt çəkildi. Onda onu da müvəqqəti evə buraxmışdılar. Evdə dözüb dayana bilmirdi. Laçının əldən verilməsi çox ağır gəlirdi Əliyə. Az sonra – oktyabrın 14-də Gəncə batalyonunun tərkibində Ağdərə cəbhəsinə yollandı. Sovet ordusunda tikinti batalyonunda xidmət etsə də qanlı vuruşlara cəsarətlə atıldı, özünü cəsur döyüşçü kimi göstərdi. Təəssüf ki, döyüş yolu çox qısa oldu. Üç ay beş gün… Sonra isə…Dünyanın bu cənnət-məkanlıq guşəsində uyuyanlar sırasında isə xiyabandan o qədər də uzaq olmayan Söyüdlü kəndinin ilk şəhidi, Vətən torpaqlarının azadlığı uğrunda qan-içən, murdar ermənilərlə haqq mübarizəsində gözlərini işıqlı dünyaya əbədi yummuş, dünyasını çox vaxtsız dəyişmiş daha bir növcavan – Musayev Əli Səməd oğlu da var.

# Musayev Ərəstun Şəmistan oğlu



Musayev Ərəstun Şəmistan oğlu Gədəbəy rayonunun Böyük Qaramurad kəndində 2 aprel 1975-ci ildə doğulmuşdur. Böyük Qaramurad kənd məktəbinin 1-ci sinfinə 1982-ci ildə daxil

olub, həmin məktəbin onuncu sinfini 1992-ci ildə bitirmişdir. 5 may 1993-cü ildə Azərbaycan Ordusu sıralarına getmişdir. 1993-cü ilin avqust ayında doğma Gədəbəyə qayıtmış, İvanovka, Sarıqaya, Turşsu və Qaraarxaqda gedən döyüşlərdə vuruşmuşdur. 8 aprel 1996-ci ildə şəhid olmuşdur.

## Mustafayev Faiq Musa oğlu



Mustafayev Faiq Musa oğlu 1967-ci il oktyabrın 19-da Daşkəsən rayonunun Mollahəsənli kəndində anadan olmuşdur. Şəmkir rayonunun Bayal kəndində traktorçu işləmişdir.

Sovet ordusu sıralarında xidmətdən qayıtdıqdan sonra 1992-ci ildə könüllü olaraq Qarabağ uğrunda döyüşlərdə iştirak etmişdir. 28 dekabr 1993-cü ildə Ağdam rayonunun Salahlı kəndi uğrunda gedən döyüşlərdə şəhid olmuşdur. İki qızı vardır.

## Mustafayev Fariz Şəmistan oğlu



Mustafayev Fariz Şəmistan oğlu 1974-cü il oktyabrm 13-də Leşkər kəndində anadan olub. Təhsilini 1982-ci ildə Leşkər kənd natamam orta məktəbində başlamışdır. 1990-cı ildə Kiçik Qaramurad kəndində orta məktəbin 9-cu sinfinə getmiş və oranı 1992-ci ildə bitirmişdir. Həmin ilin 22 de-kabrmda hərbi xidmətə yola düşüb. Bakıda Piriküşküldə hərbi hissədə təlim keçir. Təlimdən sonra Ağdama yola düşüb. Ağdam uğrunda gedən döyüşlərdə 1993-cü il 5 iyunda itgin düşmüşdür.

# Namazov Vidadi Qoşunəli oğlu

Namazov Vidadi Qoşunəli oğlu 1963-cü ildə Gədəbəy rayonunun Novoivanovka kəndində anadan olmuşdur. 1970-ci ildə Novoivanovka kənd orta məktəbinə getmiş, 1980-cı ildə həmin məktəbi bitirmişdir. 1981-ci ildə hərbi xidmətə çağırılmış 1983-cü ildə xidməti başa vurmuşdur. Namazov Vidadi Qoşunəli oğlu 1992-ci ilin sentyabr ayının 20-də Pereval yüksəkliyinə qalxarkən mina qəlpəsindən həlak olmuşdur. Ailəli idi, 3 övladı var.

# Nağıyev Mədət Şəmil oğlu



Nağıyev Mədət Şəmil oğlu 1928-ci ildə Gədəbəy rayonun Göyəlli kəndində doğulmuşdur. 1935-ci ildə Göyəlli kənd orta məktəbinə daxil olmuş, 1943-cü ildə həmin məktəbi bitirmişdir. Məktəbi bitirdikdən sonra hərbi xidmətə çağırılmış və xidməti başa vurduqdan sonra Vətənə dönüb ailə qurmuşdur. 11 övladı olmuşdur. Bir müddət kolxozda işləmişdir. 1990-cı il iyun ayının 26-da ermənilərin Şınığa hücumu zamanı qəhrəmancasına şəhid olmuşdur.

# Nəbiyev Aydın Bayram oğlu



Nəbiyev Aydın Bayram oğlu 1970-ci ildə Gədəbəy rayonunun Daryurd kəndində anadan olmuşdur.

1987-ci ildə Daryurd kənd orta məktəbini qurtarıb.

1988-90-cı illərdə Sovet ordusunda xidmət etmişdir. Hərbi xidmətdən sonra Gəncə Alüminium zavodunda çalışıb. Erməni işğalçılarnın torpaqlarımıza təcavüzü zamanı hamı kimi Aydın da Vətəninizin müdafiəsinə qalxmışdır. O, 1992-ci ildə Azərbaycan ordusu sıralarına daxil olmuşdur. Qazax, Ağdarə və Ağdam bölgələrində erməni işğalçılarına qarşı fədakarlıqla vuruşmuşdur. 16 avqust 1993-cü ildə qəfil düşmən

gülləsi Aydının Və-tən eşqiylə döyünən ürəyini əbədi olaraq dayandırmışdır. Allah rəhmət eləsin!

# Nəbiyev Eldar Heydər oğlu



Nəbiyev Eldar Heydər oğlu 1975-ci ildə Gədəbəy rayonunun Arabaçı kəndində anadan olmuşdur.

1992-ci ildə kənd orta məktəbində təhsilini müvəffəqiyyətlə başa vurmuşdur. 1993-cü ilin oktyabrında hərbi komissarlıq tərəfindən hərbi xidmətə çağırılmışdır. Bir ay təlim keçdikdən sonra əvvəlcə Füzuli, sonra Ağdam, Kəlbəcər bölgələrində torpağımızın azadlığı uğrunda gedən döyüşlərə atılmışdır. Murovda, Yaşlı, Koroğlu, Keçi dağında gedən ölüm-dirim savaşında torpağını canmdan əziz bilən igid döyüşçü kimi vuruşmuş, komandir və döyüş dostlarının rəğbətini qazanmışdır. 1994-cü il martın 18-də Kəlbəcər bölgəsində Murovdağ uğrunda gedən döyüşlərdə qəhrəmancasına şəhid olmuşdur. Subay idi. İlk məhəbbəti tumurcuqlamamış, həyatdan kam almamış bu dünyadan köçdü Eldar. Ürəklərə, xatirələrə, el-obasnın, qohum-əqrabasının yaddaşına köçdü, özü də əbədilik.

## Niftalıyev Əsgər Bəhram oğlu



Niftalıyev Əsgər Bəhram oğlu 1933-cü ildə Gədəbəy rayonunun Əyridərə kəndində anadan olmuşdur. Təhsilini Hacılar kəndində almışdır. Sovet ordusu sıralarında xidmət etmişdir. Qayıtdıqdan sonra doğulduğu kənddə ailə həyatı qurmuşdu. Beş uşaq atası idi. 2001-ci il tarixində erməni terrorçuları tərəfindən qətlə yetirilmiş, şəhid olmuşdur. O çox xeyirxah bir insan idi. Şınıx kəndlərində böyük hörməti var idi. Demək olar ki, Hacılar və başqa kənddə yaşayış binalarının çoxunda onun əl işi var və həmin binaların təməlini xeyirxah insan Əsgər Niftalıyev qoymuşdur.

## Nuriyev İsmayıl Mustafa oğlu



Nuruyev İsmayıl Mustafa oğlu 1928-ci ildə Gədəbəy rayonunun Göyəlli kəndində anadan olmuşdur.
1935-ci ildə Göyəlli kənd orta məktəbinə daxil olmuşdur. 1943-cü ildə məktəbi qurtarmış sonra hərbi xidmətə getmişdir. Hərbi xidmətdən qayıtdıqdan sonra ailə qurmuş-dur. 9 uşağı olmuşdur. Bir müddət kolxozda işləmişdir. 1990-cı il iyun ayının 26-da ermənilərin kəndimizə hücumu zamanı qəhrəmancasına şəhid olmuşdur.

## Ocaqverdiyev Elçin Aydın oğlu



Ocaqverdiyev Elçin Aydın oğlu 1971-ci il oktyabrm 8-də Gədəbəy rayonunun Arıqdam kəndində anadan olub. 1978-ci ildə həmin kəndin orta məktəbinə getmiş, 1988-ci ildə orta təhsilini başa vurmuşdur. 1990-cı ildə hərbi komissarlıq tərəfindən hərbi xidmətə çağırılıb. İlk döyüş yolunu Gədəbəy dağlarından başlayıb. İvanovka kəndində N saylı hərbi hissədə qulluq edib. Krasnoselsk yaxınlığında İskəndər qalasının alınmasında iştirak edib, sonra Kəlbəcərə göndərilib. Orada bütün döyüşlərdə iştirak edib. 1994-cü il fevralın 17-də Kəlbəcərin Murovdağ uğrunda gedən döyüşlərində itkin düşüb.

# Ocaqverdiyev Bakir Cəmil oğlu



Ocaqverdiyev Bakir Cəmil oğlu 28 yanvar 1975-ci ildə Gədəbəy rayonunun Söyüdlü kəndində anadan olub. O, 1982-ci ildə Söyüdlü kənd orta məktəbinə daxil olub 1989-cu ildə həmin məktəbin 8-ci sinfini bitirmişdir. Sonra işləyib ailəsinə kömək etmişdir. 1994-cü il 10 yanvarda hərbi xidmətə çağırılmışdır. 24 aprel 1994-cü ildə Ağdam rayonunun şotlanlı kəndində erməni işğalçılarına qarşı gedən döyüşlərdə itgin düşmüşdür. Həmin vaxtdan bu günə kimi onun taleyi barədə heç bir məlumat yoxdur. Atası Ocaqverdiyev Cəmil Abduləli oğlu 1999-cu ildə rəhmətə getmişdir. Oğlunun itgin düşməsinə dözə bilməmişdir. Bacısı Ocaqverdiyev Nazakət Cəmil qızı qardaşının itkin düşməsinə dözməyib ruhi xəstəliyə tutulmuş və 2001-ci ildə rəhmətə getmişdir.

# Ocaqverdiyev Bakir Cəmil oğlu



Ocaqverdiyev Bakir Cəmil oğlu 28 yanvar 1975-ci ildə Gədəbəy rayonunun Söyüdlü kəndində anadan olub. O, 1982-ci ildə Söyüdlü kənd orta məktəbinə daxil olub 1989-cu ildə həmin məktəbin 8-ci sinfini bitirmişdir. Sonra işləyib ailəsinə kömək etmişdir.

1994-cü il 10 yanvarda hərbi xidmətə çağırılmışdır. 24 aprel 1994-cü ildə Ağdam rayonunun şotlanlı kəndində erməni işğalçılarına qarşı gedən döyüşlərdə itgin düşmüşdür. Həmin vaxtdan bu günə kimi onun taleyi barədə heç bir məlumat yoxdur. Atası Ocaqverdiyev Cəmil Abduləli oğlu 1999-cu ildə rəhmətə getmişdir. Oğlunun itgin düşməsinə dözə bilməmişdir.
Bacısı Ocaqverdiyev Nazakət Cəmil qızı qardaşının itkin düşməsinə dözməyib ruhi xəstəliyə tutulmuş və 2001-ci ildə rəhmətə getmişdir.

# Orucov İbrahim Şəmil oğlu



Orucov İbrahim Şəmil oğlu 1934-cü ildə sentyabrın 17-də Gədəbəy rayonun Göyəlli kəndində anadan olub. 4 övladı var. 1993-cü il avqust ayının 5-də əsgərlərə silah apararkən ermənilər tərəfindən öldürülüb.

# Paşayev Afiq Rza oğlu



Paşayev Afiq Rza oğlu 2 iyun 1972-ci ildə Gədəbəyin Böyük Qaramurad kəndində anadan olmuşdur. 1979-cu ildə birinci sinfə gedib. 1989-cu ildə orta məktəbi qurtarıb. 3 iyun 1990-cı ildə Sovet ordusunda iki il qulluq edib. 1992-ci ilin oktyabr ayında Tərtər bölgəsində hərbi xidmətdə olub. Həmin il Ağdərə döyüşlərində həlak olmuşdur. Subay idi.

# Paşayev Tofiq Əziz oğlu



Paşayev Tofiq Əziz oğlu 1968-ci ildə Gədəbəy rayonun Əyridərə kəndində anadan olmuşdur. 1975-ci ildə Hacılar kənd orta məktəbinin birinci sinfinə daxil olub, 1985-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1986-cı ildə hərbi xidmətə getmişdir. 1988-ci ildə hərbi xidmətdən qayıtmışdır. 1988-90-cı illərdə Maliyyə-kredit texnikumunu bitirmişdi. 1990-cı ildən Hacılar kolxozunda iqtisadcı vəzifəsində işləmişdir.

20 may 1993-cü il tarixdə erməni quldurları tərəfindən sərhəddə şəhid edilmişdir. Rəna: Atam şəhid olduğu zaman mənim 2 yaşım olubdur. Mən böyüdükcə, sinifdən-sinfə keçdikcə, dərslik kitablarında şəhid olan azərbaycanlı oğulları haqqında öyrəndikcə atam barədə daha çox düşünürəm. Atamın da onlar kimi kitabda adının çəkilməyi məni çox sevindirdi. Nəinki mən, mənim bütün qohumlarım da sevindilər. Mən də böyüyəndə Azərbaycan torpaqlarının Bütövlüyü uğrunda azərbaycanlı qəhrəman qızlar kimi mən də əlimdən gələnləri əsirgəməyəcəm, Vətən uğrunda, xalq uğrunda, həmişə hazır olacam.

# Paşayev Murad Nəbi oğlu

Paşayev Murad Nəbi oğlu 1969-cu ildə Gədəbəy rayonunun Yenikənd kəndində anadan olub.1973-cü ildə Novosaratovka kənd orta məktəbinin birinci sinfinə daxil olub. 1983-cü ildə orta məktəbi bitirib. 1992-ci ilin iyun ayında hərbi xidmətə gedib. 1987-ci ildə Sovet ordusu sıralarında həqiqi hərbi xidmətə çağırılıb. 1989-cu ildə ordudan hərbi xidmətini başa vurub. 1990-cı ildə Bakı İnşaat texnikumuna daxil olub. Texnikumu qurtarmağına 2 ay qalmış könüllü olaraq Qarabağa gelib. 18 aprel 1991-ci il tarixdə Ağdam uğrunda gedən döyüşlərdə itgin düşüb. Subay idi.

# Rüstəmov Sahib Əkbər oğlu



Rüstəmov Sahib Əkbər oğlu 5 may 1950-ci ildə Gədəbəy rayonunun Düzrəsullu kəndində kolxozçu ailəsində anadan olmuşdur. 1957-ci ildə Düzrəsullu kənd orta məktəbinin birinci sinfinə getmiş, 1967-ci ildə isə həmin məktəbin onuncu sinfini bitirmişdir. Sovet Ordusu sıralarında öz hərbi xidmətini başa vurduqdan sonra Düzrəsullu kəndindəki “Sovet Qazaxıstanı” kolxoz və sovxozlarında ən bacarıqlı, işgüzar bir mexanizator kimi işləmiş, 1989-90-cı illərdə isə könüllü olaraq Azərbaycan Ordusu sıralarına hərbi xidmətə getmişdir və ən cəsur topçu kimi şöhrət qazanmışdır. 1993-cü ildə isə öz ana torpağı uğrunda gedən ağır döyüşlərin birində yaralanmış və mərdliklə şəhid olmuşdur.

# Rüstəmov Vahid Qiyas oğlu



Rüstəmov Vahid Qiyas oğlu Gədəbəy rayonunun Böyük Qaramurad kəndində 25 yanvar 1971-ci ildə doğulmuşdur. Böyük Qaramurad kənd orta məktəbinin birinci sinfinə 1978-ci ildə daxil olub. 1988-ci ildə həmin məktəbin onuncu sinfini qurtarıb. Sovet ordusu sıralarına 1989-cu ildə getmiş, 1991-ci ildə qayıtmışdır. Azərbaycan ordusuna 1992-ci ilin 12 avqustunda getmiş və Kəlbəcər döyüşlərində 25 mart 1994-cü ildə şəhid olmuşdur.

# Rüstəmov Cahangir İsgəndər oğlu



Cahangir İsgəndər oğlu Rüstəmov 1939-cu ildə Gədəbəy bölgəsinin Düzrəsullu kəndində anadan olmuşdur. Orta məktəbi qurtardıqdan sonra, ordu sıralarına çağırılmış, hərbi xidməti başa vurduqdan sonra hissə komandirinin göstərişi ilə zabit kimi fəaliyyətini davam etdirmişdir. 1972-ci ildə Vasilkov Hərbi Aviasiya Texniki Məktəbini qurtarmış, ordu hissələrində müxtəlif vəzifələrdə işləmişdi. C.Rüstəmov peşəsini ürəkdən sevirdi. Bütün mənalı ömrünü bu sahəyə həsr etmişdi. Keçmiş Sovet ordusunda alay komandiri vəzifəsinə qədər şərəfli bir yol keçmişdi. 1988-ci ildə ordu sıralarından istefaya buraxılmışdı.Vətənin ağır günlərində Şəmkir, Gədəbəy batalyonu yaratmışdı. Bir neçə belə özünümüdafiə batalyonları birləşdirilib alay təşkil edildi. Müdafiə naziri onu bu alaya komandir təyin etdi. Bu alay Gədəbəylə Ermənistan arasındakı 223 km-lik sərhəddin qorunmasını öz üzərinə götürdü. Azərbaycanda yerləşən rus ordusunun hərbi hissələri Azərbaycan ərazisindən çıxarılanda hərbçilər texnikanı satır, yerdə qalanları zərərsizləşdirir, istifadəsiz hala salırdılar. Bu vaxt polkovnik Cahangir Rüstəmovun təşəbbüsü ilə 1992-ci ilin aprel ayında Şəmkir rayonunda yerləşən rus hərbi hava qüvvələrinin texnikasının rus hərbçiləri tərəfindən qaçırılmasına, talan edilməsinə və zərərsizləşdirilməsinə imkan verilmədi. 11 ədəd “SU-24″, “Mİ-25″, 3 ədəd “İL-26″ təyyarələri, 1 ədəd “Mİ-8″ vertolyotu, aviatexnika, külli miqdarda hərbi sursat müsadirə edilib ələ keçirildi. 1988-ci ildən Gədəbəyin, Şınığın sərhəd kəndlərinin qorunması bilavasitə C.Rüstəmovun adı ilə bağlıdır. 1992-ci ildə Başkənd (Artsvaşen) əməliyyatı uğurla başa çatdı. Elə bu döyüşdə də onun sərkərdəlik bacarığı, mahir hərbçi olmaq keyfiyyətləri aşkara çıxdı. Torpaqlarımızın erməni quldurları tərəfindən işğalına yol verməyən polkovnik C.Rüstəmovun ömür yolu 1994-cü ilin mart ayında qırıldı. İş başında olarkən faciəli surətdə həlak oldu. Ölümündən sonra Respublika Prezidentinin 5 aprel 1994-cü il fərmanına görə “Azərbaycan Bayrağı Ordeni” ilə təltif edilmişdir.

“İdrak” qəzetinin S.Rüstəmovun ölümünə həsr olunmuş xüsusi buraxüişından (may 1994-cü il) götürülmüş materiallar:

# Rzayev Əli Eyyub oğlu



Rzayev Əli Eyyub oğlu 1969-cu ildə anadan olub. 1976-cı ildə Əmiraslanlı kənd orta məktəbinə daxil olmuşdur. 1986-cı ildə orta məktəbi bitirmişdir. Sonra Sovet ordusunda hərbi xidmətdə olmuşdur. 1990-cı ildə könüllü olaraq Milli Ordunun sıralarına getmiş, 1993-cü ildə Azərbaycanın torpaqları uğrunda gedən döyüşlərdə şəhid olmuşdur.

# Sadıqov Kamil Cəlal oğlu



Sadıqov Kamil Cəlal oğlu 1974-cü ildə Rüstəm Əliyev kəndində anadan olmuşdur. 1981-ci ildə R. Əliyev kənd 1 saylı orta məktəbinin 1-ci sinfinə daxil olub. 1991-ci ildə 10-cu sinfi bitirmişdir. 1992-ci ildə könüllü olaraq cəbhəyə getmişdir. Kamil əsgəri xidmətdə ilk dəfə Bakı şəhərində olub. Çıldıran döyüşlərində iştirak edib, sonra Ağdama gəlib. Əlindən yaralanıb. Sonra 704 saylı hərbi hissəyə köçürülüb. Gədəbəy rayonunun İvanovka kəndi uğrunda gedən döyüşlərdə iştirak edib. 1993-cü ildə Murovda gedən döyüşlərdə fevral ayının 15-də itgin düşmüşdür.

# Sadıqov Rasim Tofiq oğlu



Sadıqov Rasim Tofiq oğlu 15 sentyabr 1974-cü ildə Gədəbəy rayonunun Arabaçı sovetliyinin Fərzalı kəndində anadan olmuşdur. 21 fevral 1991-ci ildə hərbi xidmətə çağırılıb. Bakıda qvardiyada xidmət edib. Sonra müharibə cəbhəsinə yollanıb. Ağdam döyüşlərində Şelmi adlanan kənddə 21 nəfərlə birlikdə yoxa çıxıb. 4 iyul 1992-ci il məhkəmənin qərarı ilə ölmüş elan edilib və şəhid statusu alıb.

# Salmanov Ədalət Rəhim oğlu



Salmanov Ədalət Rəhim oglu 1969-cu ildə martın 16-da Gədəbəy rayonunun Göyəlli kəndində anadan olmusdur. Orta məktəbi bitirdikdən sonra 1988-90-cı illərdə Rusiyada hərbi xidmətdə olmusdur. 1991-92-ci illərdə könüllu olaraq Vətənin mudafiəsinə qoşulmuşdur. Döyüs yolunu Yəhərli, Murov, Alagöllər, Şümüklü dağlarından keçmisdir. 1993-cü il yanvarın 14-də Gədəbəy rayonunun Şümüklü postunda qəhrəmancasına həlak olmusdur. Subay idi.

# Salmanov Sadiq Söhbət oğlu



Salmanov Sadiq Söhbət oğlu 23 mart 1978-ci ildə Arıqıran kəndində anadan olub. 1996-cı ildə hərbi xidmətə gedib. 22 iyun 1998-ci ildə 703 saylı hərbi hissədə mühəndis istehkam bölüyündə, Tərtər rayonunun Marquşavan kəndində hərbi xidmətdə olub. 1998-ci il iyun ayının 22-də döyüş tapşırığını yerinə yetirərkən qəfil açılan düşmən gülləsindən ağır yaralanıb şəhid olmuşdur. O, 1995-ci ildə Arıqıran kənd orta məktəbini bitirmişdir. Məktəbdə

oxuduğu müddətdə müəllimlərinin və şagird yoldaşlarının dərin hörmətini qazanmış, indi də hamının istəklisi kimi ürəklərdə yaşayır. Hərbi xidmətdə olduğu iki il müddətində hər vaxt komandirlərinin döyüş tapşırığını yerinə yetirməklə bərabər öz mərdliyi, cəsurluğu ilə fərqlənmişdir. Bu çılğın gənc döyüşçünün ən böyük arzusu torpaqlarımızın erməni quldurlarından tezliklə azad olması idi. O, bütün ümüd və arzularının qırılacağını xəyalına belə gətirə bilməzdi. Atalar deyib: “Sən saydığını say, gör fələk nə sayır”. Alın yazısıdı, neyləmək olar. Bu, təkcə atası Salmanov Söhbətin, anası Pəri xanımın, qardaşları Namiqin və Natiqin itkisi deyildi. Sadiq eldən getdi. O, el yolunda Vətən yolunda canından keçdi. Onun əziz xatirəsi xalqın ürəyində əbədi yaşayacaq və hər zaman yad olunacaq.

Yerin behişt olsun, əziz qardaşım!

# Sarıyev İlqar Mahmud oğlu



Sarıyev İlqar Mahmud oğlu 10 mart 1970-ci ildə Gədəbəyin Heriknaz kəndində anadan olub. O, 1987-ci ildə Gədəbəy rayonu Hacıalılar kənd orta məktəbini bitirmişdir. Həmin ilin sentyabr aymda Abşeron rayonu 147 saylı peşə məktəbinə daxil olub, ekskavator maşinisti peşəsinə yiyələnmişdir. 20 iyun 1988-ci ildə hərbi xidmətə getmiş, 19 iyun 1990-cı ildə xidmətini başa vuraraq evə qayıtmışdır. 1991-ci il 2 fevralda isə Gədəbəy şəhəri 148 saylı TPM-ə daxil olmuş, 4 noyabr 1991-ci ildə 5-ci dərəcəli baytar operatoru peşəsini almışdır. 1993-cü ilin noyabr ayında Milli Ordumuz yaradılarkən könüllü olaraq torpaqlarımızın azadlığı uğrunda döyüşə yollandı. Bir ay Seyfəlidə poliqonda iştirak etmiş, orada pulemyotçuluğu öyrəndikdən sonra Ağdam rayonu uğrunda gedən döyüşlərdə fəal iştirak etmişdir. 1994-cü il 6 mayda qaniçən ermənilərin gülləsinə düçar olmuş və həlak olmuşdur.

# Şirinov Rəhman İsa oğlu



Rəhman Şirinov 1973-cü il yanvar ayının 3-də Yenikənd kəndində doğulub boya-başa çatmışdı. 1990-cı ildə keçmiş Sovet silahlı qüvvələrində xidmətə yollananda qəlbindən bir sızıltı kezmişdi. "Doğma yurd, doğma torpaqlar səksəkəli, ağır günlərini yaşayır. Mən isə özgə torpaqlarnıı qorumağa yollanıram" demişdi. Ukrayna hərbi dairəsində xidmətə başlayan Rəhman ana torpaqdan aldığı ağır xəbərlərə dözmədi. Yarım il keçməmiş qəlbində Vətən, torpaq, yurd həsrəti ilə geri qayıtdı. Rayonumuzda yaradılan özünümüdafiə taboruna üzv yazıldı.

Şınıx bölgəsində düşmən həmlələrinin qarşısının alınmasında cəsarətlə iştirak etdi. Çoxlarına nümunə göstərdi. Evlərinə, ailəsinə xoş sədası gəldi. Dedilər belə qorxmaz oğulla öyünməyinizə dəyər. Sevindi ata-ana, qardaş-bacı. Hərəsinin qəlbində Rəhman üçün təzə bir dünya, yeni bir səhifə açıldı.

Ağır əməliyyatların birində daha zox fərqləndiyini nəzərə alan komandiri ona çavuş rütbəsi verildiyini söylədi. Bu, Rəhman üçün ən böyük mükafat idi. Qəlbi dağa dönmüşdü. Bilmirdi nə etsin, komandirinə necə söyləsin ürək sözlərini. Sonra daxilində bir səs baş qaldırdı. "Neçə ki quldurlar torpaqlarımıza göz dikiblər, mübarizədən dönməməli, daha yaxşı döyüşməlisən! Bu, sənin komandirlərinə, valideynlərinə və sənin kimilərin cəsarətinə, dəyanətinə inanan Vətənə ən ləyaqətli xidmətin olacaq. " Bəli, Rəhman bu amalla, bu istəklə öndə addımladı. Düşmənə aman vermədi. Onun qanlı caynaqlarını qırmağa can atdı. Lakin… 1992-ci il noyabrın 17-də düşmən tərəfindən başlanan ağır döyüşlərin birində R.Şirinov qəhrəmancasına həlak oldu. Onu Gədəbəy rayonunun "Şəhidlər xiyabanı"nda dəfn etdilər. Təkcə valideynləri deyil, bütün el-oba Rəhmana yas saxladı. Yandırdı hamını bu vaxtsız olüm, dağ çəkdi sinələrə. Analar, bacılar qara bağladı, qara geydi o gün. Təbiət də ağladı, öz igidini son mənzilə yola salarkən. Ölməz Rəhman kimi oğullar. Onlar öz şəhidlikləri ilə əbədiyyət qazanmış, qəlblərdə özlərinə həmişəlik yuva salmışlar.

“Tərəqqi” qəzeti, avqust 1995-ci il

# Şahrızayev Şakir Firudin oğlu



Şahrzayev Şakir Firudin oğlu 12 iyul 1975-ci ildə Gədəbəy rayonunun Novosaratovka kəndində anadan olub. 1981-ci ildə Novosaratovka kənd orta məktəbinin 11-ci sinifini bitirib. 1993-cü ilin iyul ayında hərbi xidmətə getmişdir. 3 avqust 1993-cü ildən 17 fevral 1994-cü ilədək 171 saylı hərbi hissədə xidmət etmişdir. 17 fevral 1994-cü il tarixdə Kəlbəcər bölgəsində gedən döyüşdə itkin düşmüşdür. Subay idi.

# Tağıyev Altay Oruc oğlu



Tağıyev Altay Oruc oğlu 12 iyul 1967-ci ildə Gədəbəy rayonunun Göyəlli kəndində sıravi kolxozçu ailəsində dünyaya göz açmışdır. O, 1974-cü ildə Göyəlli kənd orta məktəbinin 1-ci sinifinə daxil olub, 1984-cü ildə həmin məktəbi bitirmişdir. 1985-87-ci illərdə Sovet ordusunda xidmət etmişdir. 1993-cü ildə torpaqlarımız uğrunda gedən döyüşlərdə könüllü olaraq Azərbaycan ordusu sıralarına qatılmışdır. 1994-cü il yanvar ayının 30-da torpaqlarımızın müdafiəsi zamanı qəhrəmancasına həlak olmuşdur. Subay idi.

## Tağıyev Fəxrəddin Cəbrayıl oğlu



Tağıyev Fəxrəddin Cəbrayıl oğu 5 yanvar 1969-cu ildə Gədəbəy rayonunun Düzrəsullu kənd İƏV-i üzrə nümayəndəliyin Göyəlli kəndində kolxozçu ailəsində anadan olmuşdur. 1976-cı ildə Zamanlı kənd orta məktəbinin 1-ci sinfinə getmiş, 1987-ci ildə isə həmin məktəbin 10-cu sinfini bitirmişdir. O, məktəbi bitirdikdən sonra 1988-ci ildə Sovet ordusu sıralarına çağırılmışdır. Hərbi xidmətini bitirib Vətənə gəldikdən onra Azərbaycan milli ordusu sıralarına çağırılmışdır. Bir neçə döyüş yolu keçdikdən sonra 1993-cü ildə Ağdərə uğrunda gedən döyüşlərdə itkin düşmüşdür.

## Tağıyev Ramiz Mürsəl oğlu



Tağıyev Ramiz Mürsəl oğlu 1959-cu ildə Gədəbəy rayonunun Novosaratovka kəndində anadan olmuşdur. 1965-ci ildə Novosaratovka kənd orta məktəbinin 1-ci sinifinə daxil olub və 1975-ci ildə həmin məktəbi bitirmişdir. Ailəlli olub, üç övladı var. Hal-hazırda onun övladlarının ikisi orta təhsil almış, üçüncüsü isə Novosaratovka kənd orta məktəbində təhsilini davam etdirir. Həyat yoldaşı Novosaratovka kəndində sahibsiz qocalara xidmət edir. Atası Tağıyev Mürsəl İsmayıl oğlu onun ailəsinə hər tərəfli himayədarlıq edir.

## Tağıyev Rasim Məhəmməd oğlu



Tağıyev Rasim Məhəmməd oğlu 1969-cu ilin yanvarında Gədəbəy rayonunun Düzrəsullu kənd İƏV-i nümayəndəliyi Göyəlli kəndində dünyaya göz açıb. 1976-cı ildə Zamanlı kənd orta məktəbinə daxil olub və həmin məktəbi 1987-ci ildə bitirdikdən sonra Sovet ordusu sıralarına hərbi xidmətə çağırılmışdır. Qayıtdıqdan sonra, ermənilərin tor-paqlarımıza təcavüzü onun 1990-cı ildə könüllü olaraq döyüşlərə qatılmasına səbəb oldu. Əyninə əsgər paltarı geyinib Vətənimizin müdafiəsinə qalxdı. Şərəfli döyüş yolu keçdi. Gədəbəydə Mutudərə, Kaftar, Mormor, Başkənd əməliyyatlarının keçirilməsində bütün bacarığı ilə iştirak etdi. Döyüşlərin birində düşmənlərin üç tankının partladılıb sıradan çıxarılmasında və bir tankın qənimət götürlməsində Rasimin böyük rolu oldu. Bundan başqa, onların dəstəsi ermənilərin müasir tipli radiostansiya ilə təchiz olunmuş “UAZ” və “Niva” markalı avtomaşınlarının ələ keçirilməsində fəal iştirak etmişdir. O, sürücü olmaqla yanaşı, həm də sərrast atıcı idi. Gədəbəy bölgəsində gedən döyüşlərdə bir ildən artıq iştirak edən Rasimin son döyüşü 1992-ci ilin avqust ayının 30-da Hörükdaş əməliyyatı zamanı oldu. O, bu döyüşdə də böyük qəhrəmanlıq göstərərək şəhidlik zirvəsinə ucaldı.

# Tağıyev Şamət Qoşunəli oğlu



Tağıyev Şaməd Qoşunəli oğlu 1974-cü ildə Gədəbəy rayonunun Rüstəm Əliyev kəndində anadan olub. 1992-ci ildə orta məktəbi bitirdikdən sonra Sumqayıt şəhərində Texnologiya texnikumuna daxil olub. 1992-ci il oktyabr ayının 18-də Sumqayıt şəhər hərbi komisarlığından həqiqi hərbi xidmətə çağırılıb. Xidmət müddəti ərzində özünü igid, cəsur, torpaq uğrunda aparılan mübarizədə mərdliklə seçilən nümunəvi əsgər kimi göstərib. İştirak etdiyi bütün döyüş bölgələrində aparılan əməliyyatlarda fəallıqla iştirak edib. Şaməd Ağdam, Kəlbəcər, Ağdərə bölgələrində gedən döyüşlərin fəal işti-rakçısı olub. Özünə qarşı tələbkar olan Şamət bütün komandirlərinin əmrlərini və döyüş tapşırıqlarını vaxtında və dəqiq yerinə yetiridi. O,

döyüş yoldaşları arasmda böyük hörmət qazanmışdı. Çox istiqanlı, etibarlı və qorxmaz bir döyüşçü kimi həmişə əsgərlərə örnək olmuşdur. Sıravi Tağıyev 1 fevral 1994-cü il tarixdə Ağdam rayonunun Novruzlu kəndi uğrunda gedən döyüşdə tabur tərkibində erməni mövqeyinin arxasına keçərək çoxlu sayda erməni quldurlarının məhv edilməsində fəallıq göstərmişdir. O, mühasirəyə düşmüş, lakin mühasirəni yarıb çıxmağa imkan tapmış, öz pulemyotu ilə xeyli erməni quldurunu məhv etmişdir. Şamədin son döyüşü elə Novruzlu kəndində olub. 29 mart 1994-cü ildə kənd uğrunda gedən döyüşdə yaralanıb. Təcili Bərdə rayon qospitalına, oradan da Bakıya çatdırılsa da onun həyatmı xilas etmək mümkün olmayıb. 31 mart 1994-cü ildə şəhid olub, əbədiyyətə qovuşub. Rüstəm Əliyev kəndinin 2 saylı məktəbi ilk şəhidi olan Şaməd Tağıyevin adını daşıyır.

# Tağıyev Vüqar Bəhram oğlu



Tağıyev Vüqar Bəhram oğlu 1973-cü ilin may ayının 24-də Gədəbəy rayonunun İsalı kəndində anadan olmuşdur. 1982-ci ildə İsalı kənd orta məktəbinə getmiş, 1990-cı ildə orta təhsilini başa vurmuşdur. Həmin ildə hərbi xidmətə çağırılmışdır. 1990-91-ci ildə Ukraynada hərbi xidmətdə olmuş və 1992-ci ildə Vətənə dönmüşdür. Bundan sonra, Azərbaycanın bütövlüyü uğrunda gedən döyüşlərdə 4 il iştirak etmişdir. 1996-cı il avqust ayının 16-da minaya düşüb həlak olmuşdur. Evli idi. Bir övladı var.

# Tanarverdiyev İbad Əhməd oğlu



Tanrıverdiyev İbad Əhməd oğlu 1972-ci il iyulun 7-də Gədəbəy rayonunun Şurakənd İƏV-nin Arabaçı kəndində anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra 1989-cu ildə Gəncədə 3 aylıq sürücülük kursunu bitirib. 1990-cı il mayın 5-də Sovet ordusunda hərbi xidmətə çağırılıb. 1991-ci il aprelin 5-nə kimi Vladiqafqazda xidmət etmişdir. Ordudan

qayıdan kimi, elə həmin ayın 15-də Gədəbəy rayon hərbi komissarlığı tərəfindən Azərbaycan silahlı qüvvələri sırasına çağırılıb. 1993-cü il Ağdamda Fərrux dağı uğrunda gedən döyüşlərdə, 1992-1993-cü illərdə Başkənd əməliyyatında iştirak etmiş, Şınıxda, Alagöllərdə qəhrəmancasına vuruşmuşdur. 1994-cü ildə Kəlbəcər uğrunda gedən döyüşlərdə iştirak etmişdir. Xalası oğlu Atəşin dediyinə görə fevralın 12-də döyüş yoldaşları ilə mühasirəyə düşüb. Onları mühasirədən çıxarıb, lakin özü mühasirədə qalıb. Elə o vaxtdan bu cəsur döyüşçü haqqın-da heç bir məlumat yoxdur .İbad serjant rütbəsində idi. Sərrast pulemyotçu kimi döyüş yoldaşları arasında ad çıxarmışdı.

# Veysov Rəsul Əkbər oğlu



O, bu mahnını çox sevirdi: “Duman salamat qal, dağ, salamat qal” – ömrünün sevincli anlarında da, kədərli anlarında da, özü də özünəməxsus tərzdə. Həyat çox qəribədir və qəribəlik orasındadır ki, Rəsul bu mahnını ömrünün son anlarında da oxumuşdu. Sevincindən oxumuşdu və sözlər dodağında yarımçıq qalmışdı. Namərd gülləsi onu sona kimi oxumağa qoymamışdı… Rəsul Əkbər oğlu Veysov Gədəbəy rayonunun Nərimankənd kəndində ziyalı ailəsində anadan olmuşdur. Əkbər müəllim özü rayonda tanınmış riyaziyyat müəllimi idi və ümumiyyətlə onun ailəsinə “riyaziyyatçılar ailəsi” deyirdilər. Çünki onun ailəsində uşaqların hamısı atasının yolu ilə getmiş, dəqiq elmlər sahəsində ali təhsil almış, aspiranturanı qurtarmışdı. Təkcə Rəsuldan başqa. Hələ uşaqlıqdan hüquqşünas olmaq arzusu ürəyində kök salmışdı və Rəsul bu arzuya çatmaqdan ötrü çətin həyat yolu keçdi. Neçə il sənədlərini toplayıb universitetin hüquq fakültəsinə verdi, həmişə də arzusunun bir addımlığında qaldı. Lakin heç bir nəsihət onu fikrindən döndərə bilmədi. Qərarı qəti idi — hüquqşünas olacaqdı. İstehsalatda işlədi, ancaq kitab əlindən düşmədi. İmtahanlara dönə-dönə hazırlaşdı. Axır ki arzusuna çatdı. Hüquq fakültəsinin hazırlıq şöbəsinə qəbul oldu. İllər quş kimi ötüb keçdi. Rəsul ali məktəbi uğurla başa vurub hüquqşünas kimi işə başladı. Ürəyində bəslədiyi arzuya çatmışdı. Qanunların aliliyi, insan hüquqlarının taptalanmaması, ədalətin bərqərar olması onun həyat amalı idi.

Ancaq…Erməni quldurlarının suveren respublikamızın ərazisinə basqın, doğma torpaqlarımızın dağıdılıb viran edilməsi Rəsulu narahat edirdi. Odur ki, könüllü olaraq döyüş bölgələrinə yollandı. Onun döyüş yolu Qarabağdan deyil, Ermənistanla həmsərhəd olan və ən ağır nöqtələrdən sayılan Qazax bölgəsindən başlandı. Döyüş yoldaşları Rəsulun qəhrəmanlıqlarını indinin özündə də xatırlayırlar. O, doğrudan da ölümün gözünə dik baxan, ondan qorxmayan bir igid idi. Minalanmış ərazilərin təmizlənməsi Rəsulgilin dəstəsinə həvalə olunmuşdu. Qarabağda döyüşlərin gücləndiyi anlarda Rəsul könüllü olaraq yenidən ön cəbhəyə yollandı. Burada da Rəsul özünü əsil qəhrəman, cəsur, igid bir döyüşçü kimi göstərdi. Erməni quldurlarının hücumlarının qarşısının alınıb onların məhv edilməsində, texnika itirməsində onun rəhbərlik etdiyi dəstənin xüsusi rolu vardı.
O, bəlkə də sevimli mahnısnı çox oxuyacaqdı. Adi bir təsadüf onun mahnısını qırıq-qırıq etdi, yayıldı Vətən tor-paqlarına. … Rəsulgilin dəstəsi düşmən tankını sərrast atəşlə məhv etmişdi. Yanan tankdan quldurlar çıxanda döyüşçülərimiz onları bir-bir məhv edirdi. Rəsula elə gəldi ki, hər şey bit-mişdir. Odur ki, sevimli mahnısını oxuyub yanan tanka doğru addımladı.Yoldaşları hələ gözləməyi xahiş etdilər. Ancaq cəsur komandir səngərdən çıxıb irəlidəki yanan tanka tərəf irəlilədi. Və qəfil namərd gülləsinə tuş gəldi. O, mərdliklə əbədiyyətə qovuşdu.

# Verdiyev Elçin Səlim oğlu



Verdiyev Elçin Səlim oğlu 1974-ci il avqustun 12-də Novoivanovka kəndində anadan olub. 1981-ci ildə öz kəndlərində məktəbə gedib. 4 aprel 1993-cü ildə Gədəbəy rayon hərbi komissarlığı tərəfindən hərbi xidmətə çağırılıb. İlkin hərbi təlimini rayonun özündə keçib. Şınıq bölgəsində, Pereval,

İvanovka kəndi uğrunda gedən döyüşlərdə iştirak edib. Sonra Kəlbəcər rayonunun müdafiəsinə göndərilmişdir. Axırıncı döyüşü 1994-cü ildə fevralın 12-də olmuşdur. Həmin döyüşdə itgin düşmüşdür.

## Vəliyev Bəxtiyar Mansur oğlu



Vəliyev Bəxtiyar Mansur oğlu 1974-cü ildə Gədəbəy rayonunun Slavyanka kəndində anadan olub. 1991-ci ildə Slavyanka kənd orta məktəbini bitirib. Həmin il Azərbaycan dövlət İqtisad institutuna qəbul olmuşdur. 1993-cü ildə hərbi xidmətə getmişdir. 21 aprel 1994-cü ildə Ağdərə döyüşlərində şəhid olmuşdur.

## Vəliyev Fuad Fərhad oğlu

Vəliyev Fuad Fərhad oğlu 1975-ci ildə Gədəbəy rayonunun dilbər guşələrindən biri olan Şınıx zonasınm Zamanlı kəndində dünyaya göz açmışdır. Uşaqlıq illərini Zamanlı kəndində keçirmişdir. 1982-ci ildə kənd orta məktəbinin 1-ci sinifinə daxil olub. Həmin məktəbi 1993-cü ildə əla və yaxşı qiymətlərlə başa vurub. Lakin yağı düşmənin Vətənimizə hücumu Fuadı təhsilini yarımçıq qoyub Vətənin müdafiəsinə getməyə məcbur etdi.

O, 1994-cü il yanvar ayının 14-də hərbi komissarlığa gedərək Vətənin müdafiəsi üçün hazır olduğunu bildirdi. Komissarlıq onu Biləcəri yolasalma məntəqəsinə göndərdi. Fuad iki ay yarım Nasosnu hərbi məntəqəsində təlim keçdikdən sonra, döyüş bölgəsinə göndərildi. 1994-cü ilin mart-aprel aylarında Ağdamda şiddətli döyüşlər gedirdi. Artıq Ağdamın Güllücə və Süsənli kəndləri düşmən mərmiləri altında alovlanırdı. Fuad həmin kəndlərin azad olunmasında fəal iştirak etdi. Lakin düşmən qüvvələri üstün olduğundan 200-dən artıq əsgərimiz döyüş bölgəsində şəhid oldu. Artıq Ağdam batalyonu 1994-cü ilin may ayında parçalandı. Həmin

ilin may-iyun ayında Fuad 171 №-li hərbi hissənin komandiri polkovnik Həmzəyevin sərəncamı ilə Gədəbəy rayonunun Qala kəndində yerləşən (Qocadağ) batalyonuna göndərildi. 4-5 aydan sonra Şınıx bölgəsində vəziyyətin dəyişməsi ilə əlaqədar olaraq Fuad Şınıx batalyonunun sərəncamına göndərildi. Oradan da batalyon komandiri N.Hüseynovun göstərişi əsasında Mormor kəndində yerləşən rotada qulluq etməyə başladı. Lakin 1995-ci il noyabr ayının 12-də xidmət yerində yağı düşmənin gülləsinə tuş gəldi. Fuad Vəliyev Zamanlı kəndinin qəbirstanlığında torpağa tapşırıldı.

## Vəliyev Məhər Seyfulla oğlu



Vəliyev Məhər Seyfulla oğlu 1961-ci ildə Gədəbəyin Fərzalı kəndində anadan olub. Rusiyada hərbi xidmətini başa vurduqdan sonra könüllü olaraq Azərbaycan ordusu sıralarına yazılıb. 1990-cı ildə yanvarın 30-da evə gələn zaman erməni quldurları tərəfindən öldürülmüşdür. Ailəli idi. 2 oğlu 2 qızı var.

## Vəliyev Şahin Allahyar oğlu



Vəliyev Şahin Allahverdi oğlu 7 oktyabr 1972-ci ildə Gədəbəy rayonunun Novosaratovka kəndində anadan olub. 1978-ci ildə Novosaratovka kənd orta məktəbinə daxil olub və 1988-ci ildə orta məktəbi bitirib. 5 may 1992-ci ildə milli orduya çağrılıb. 23 yanvar 1996-cı ildə avtomobil qəzasında həlak olmuşdu. Ailəli idi. Bir qızı var.

## Yunusov Seyfəddin Ağasəf oğlu

Yunusov Seyfəddin Ağasəf oğlu 1974-cü il 15 sentyabrda Gədəbəy rayonunun Arıqıran kəndində anadan olmuşdur. 1992-ci ildə orta məktəbi bitirdikdən sonra 1993-cü ildə Sumqayıtdan Azərbaycan ordusuna xidmətə çağırılıb. Bir müddət Nasosnuda xidmət etdikdən sonra Qusarda kəşfiy-atçı qrupunda xidmətə göndərildi. Sonra ermənilərə qarşı döyüşlər şiddətlənəndə o, Tərtər rayonunun Şəhlabat kəndində bir müddət xidmət etmişdir. Bu vaxt o, Ağdərə rayonu uğrunda gedən döyüşə kömək məqsədi ilə aparılmışdır. Ağdərə rayonunda Sərsənk su anbarı uğrunda gedən döyüşlərdə 9 nəfər hərbçi yoldaşı ilə kəşfiyyata göndərilmişdir (1994-cü il 20 aprel gecəsində). O zaman erməni quldurları tərəfindən mühasirəyə düşmüşlər. Düşmən bu barədə həmin anda arxa cəbhəyə xəbər verilmişdir. Arxadan kömək gəlincə Seyfəddin 9 nəfər döyüş yoldaşı ilə qəhrəmancasına həlak olmuşdur. Subay idi.



# Yusifov Afiq Əjdər oğlu



Yusifov Afiq Əjdər oğlu 1976-cı il fevralın 24-də Gədəbəy rayonunun Yenikənd kəndində anadan olub. Şəhid olarakən cəmi 17 yaşı vardı. Arzusu ali məktəbə daxil olmaq idi. Orta məktəbi əla qiymətlərlə oxuyub. Fənlərin hamısından əla qiymət alan Afiq həyatın ilk və son sınağından da üzüağ çıxdı. 1993-cü ildə Qurarxac adlı yüksəklik uğrunda gedən döyüşlərdə hərbçilərə döyüş sursatı və ərzaq apararkən azğın düşmən tərəfindən qətlə yetirilmişdir. Şəhidin cəsədi hərbçilər tərəfindən geri alınmışdır. Bəli, o, ali təhsil almaq, bu torpağa, Vətənə layiq övlad olmaq niyyəti ilə yaşayırdı. Qismətinə kiçik bir ömür payı düşsə də həyatda özünəlayiq bir iz qoydu. Şəhidlik zirvəsinə yüksəldi.

# Zeynalov Arif İslam oğlu

Zeynalov Arif İslam oğlu 1938-ci ildə Gədəbəy rayonunun Cücənli kəndində anadan olub. İsalı kənd orta məktəbini bitirmişdir. Fəhlə ailəsində böyümüşdür. Hərbi xidmətdə olmuşdur. 1965-ci illərdən radio qovşağında, sonra isə rabitə sistemində işləmişdir. 1990-cı il yanvarın 30-da Gədəbəydən qayıdarkən iş başında erməni quldurları tərəfindən qətlə yetirilmişdir. Ailəli idi. 6 uşaq atası idi.

# Zeynalov Qədir Əli oğlu



Zeynalov Qədir Əli oğlu Gədəbəy rayonunun Məmmədcəfərli kəndində anadan olub. O, elə həmin kənddə orta məktəbi bitirib və keçmiş Sovetlər birliyində hərbi xidmətdə qulluq etmişdir. Xidəmətini başa vurduqdan sonra doğma kəndə qayıdıb ailə həyatı qurmuşdu. 7 övladı vardı. Erməni quldurları tərəfindən 2001-ci ildə vəhşicəsinə qətlə yetrililmişdir. O, öldüyü günə qədər erməni quldurlarına qarşı mübarizə aparmışdır.